E-ISSN: 2674-5224
21-31 VOLUME 26 ISSUE 03 2023
ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

# ROBOT ARMS DEVELOPMENT WITH MANAGEMENT SYSTEM

**Azer Mammadov[1], Eljan Aliyev[2], Vidadi Mehdiyev[3], Rahib Huseynov[4], Nijat Mehdizade[5]**
[1,2,3,4]Azerbaijan State Oil and Industry University, [5]Azerbaijan Technical University,
[1,2,3,4]Department of Electronics and Automation, [5]Department of Mechatronics and Machinery Design
[1]Professor, E-mail: azer.mammadov@asoiu.edu.az
[2, 3, 4,5]Master's degree, Email: elcaneliyev20@outlook.com

## ABSTRACT

When the production systems of developed countries are examined, it is seen that automatic production systems are widely used. The importance of industrial robots, which are the basis of automatic production systems, is increasing day by day. Countries where industrial robots are actively used in production, are more competitive than other countries. For this reason, the development of industrial robots has become widespread.
The main advantage of using robots in production processes is that the quality level of the product produced in continuous production processes does not change depending on time. The quality level of the manufactured product is one of the main issues for both foreign and domestic enterprises. Robots have different types of classification according to the complexity of the work they must perform, according to their structural structure, degrees of freedom and the size of the work area. The article provides general information about the most used types of industrial robots and their parameters and characteristics are reviewed.
The article examined general information about the most used types of industrial robots, and their parameters and characteristics were reviewed. Their fields of application were noted and working principles were investigated. Their fields of application were noted and working principles were investigated. Teaching methods used in robot programming are mentioned and detailed information about them is provided.
The necessary algorithm for controlling robots is developed and explained. The purpose of the study is to provide information about the types of industrial robots, as well as to develop algorithms for their programming and training. To achieve this goal, the following sequence is assumed. Based on various sources, industrial robots and the theoretical and methodological foundations of their programming were studied.
Theoretical data on the types of industrial robots were analyzed according to the degree of freedom classification, which is the main method for classifying robots.
The advantages and disadvantages of industrial robots have been investigated and suitable working conditions analyzed.
The methods of training industrial robots are investigated and their pros and cons are presented.
Development and analysis of the learning algorithm required for the operation of industrial robots.
It is known that the tasks to be performed by a robot with an interface program adapted to the robot itself are programmed and downloaded to the robot using a computer. Manufacturers themselves have interface programs adapted to technology and equipment. The syntax of the commands used in these programs differs for different brands of robots. The area in which the robot will work, the movements it will perform, the sequence and speed of these movements are all programmed in the interface program. Research works are planned for implementation.

The aim of the study is to provide information about the types of industrial robots, as well as to develop algorithms for their programming and training. To achieve this goal, the following sequence is assumed. Based on various sources, industrial robots and the theoretical and methodological foundations of their programming have been studied.
**Keywords:** industrial robots, management system, robot arms, control, robot programming.

# ROBOT QOLLARIN İDARƏETMƏ SİSTEMİ İLƏ İŞLƏNMƏSİ

**Azər Məmmədov[1], Elcan Əliyev[2], Vidadi Mehdiyev[3], Rahib Hüseynov[4], Nicat Mehdizadə[5]**
[1,2,3,4]Azərbaycan Dövlət Neft və Sənaye Universiteti, [1,2,3,4]Elektronika və avtomatika kafedrası,
[5]Azərbaycan Texniki Universiteti, [5]"Mexatronika və maşın dizaynı" kafedrası
[1]professor, [1]azer.mammadov@asoiu.edu.az,
[2,3,4,5] magistrant, Email: [2]elcaneliyev20@outlook.com, Email: [3]vidadimehdiyev@gmail.com

## XÜLASƏ

İnkişaf etmiş ölkələrin istehsal sistemləri araşdırıldıqda avtomatik istehsal sistemlərin geniş tətbiq tapdığı görülür. Avtomatik istehsal sistemlərin əsasını təşkil edən sənaye robotlarının önəmi hər keçən gün artmaqdadır.
Sənaye robotlarının istehsalda aktiv istifadə edildiyi ölkələrin digər ölkələrə nisbətən rəqabət gücü yüksəkdir. Bu səbəbdən də sənaye robotlarının inkişafı geniş vüsət almışdır. İstehsalat proseslərində robotların istifadəsinin əsas üstünlüyü fasiləsiz istehsal proseslərində istehsal olunan məhsulun keyfiyyət səviyyəsinin zamandan asılı olaraq dəyişməməsidir. İstehsal olunan məhsulun keyfiyyət səviyyəsi istər xarici, istərsə də daxili müəssisələr üçün əsas məsələlərdən biridir.
Robotlar yerinə yetirməli olduqları işin mürəkkəbliyinə görə, konstruktiv quruluşuna görə, sərbəstlik dərəcələri və iş sahəsinin böyüklüyünə görə müxtəlif növ təsnifləndirmələrə malikdirlər.
Tədqiqatlar zamanı sənaye robotlarının geniş istifadə olunan növləri haqqında ümumi məlumat verilib, parametrləri və xarakteristikalarına baxılmışdır. Onların tətbiq sahələri qeyd olunub iş prinsipləri araşdırılmışdır. Bununla bərabər sənaye robotlarının üstün cəhətləri və zəif yerləri qeyd edilib, konstruksiyalarına baxılmışdır.
Robotların proqramlaşdırılmasında istifadə olunan öyrətmə üsulları qeyd edilib və onlar haqqında ətraflı məlumat təqdim edilmişdir. Robotların idarə edilməsi üçün lazımi alqoritim hazırlanmış izah edilmişdir. İdarə etmə alqoritminə uyğun olaraq python proqramlaşdırma dilində proqram təşkil edilmişdir.
**Açar sözlər:** sənaye robotları, idarəetmə sistemi, robot qollar, nəzarət, robot proqramlaşdırması.

## Giriş

Qloballaşan dünyada yeni nəsil kommunikasiya üsulları vasitəsi ilə istehsalat şirkətlərinin istehsal etdiyi məhsullar haqda dünyanın hər hansı bir nöqtəsindən olan alıcı kütləsinin məlumatlandırılması çox asan proses olmuşdur. Nəticədə istehsalat şirkətləri arasındakı rəqabət sürətlə artmışdır. Beləliklə istehsalat şirkətlərinin qarşıya qoyduqları məqsədlərdən biri - daha keyfiyyətli məhsulu daha az sərfiyyat ilə hazırlanması, geniş vüssət almışdır. Bu məqsədə çatmaq

üçün atılmış ən böyük addım avtomatika texnologiyasının istehsalat sahələrində istifadəsi olmuşdur. İnsanlar fiziki cəhətdən asılı olaraq lazım olan bütün işləri yerinə yetirə bilmədikləri üçün ilk çağlardan bəri müəyyən mexaniki qurğular hazırlayıb onların vasitəsi ilə bu işləri yerinə yetirməyə çalışmışdır. Baxmayaraq ki, bu qurğular əvvəllər insanların köməyi ilə hərəkət edirdi, zaman keçdikcə, texnologiyanın inkişafı ilə bu qurğular da müəyyən inkişaf mərhələlərindən keçərək, insana ehtiyac duymadan avtomatik şəkildə işləyəcək səviyyəyə gəlib çatmışdır. Sənayedə istifadə olunması nəzərdə tutulmuş bir çox robot növü vardır. Robotların istehsalatda istifadəsində əsas məqsəd istehsalatın sürətini və keyfiyyətini artırmaq və maliyyə sərfiyyatını azaltmaqdır. Nəzərə alsaq ki, bir çox yüksək temperaturlu, kimyəvi cəhətdən insan sağlamlığı üçün təhlükəli mühitdə insan əməyi tələb olunur, bu zaman uyğun robotların insan əməyini əvəz etməsi avtomatika sahəsində əldə edilmiş ən böyük uğurdur. 1950-ci illərdə avtomatika, elektronika və kommunikasiyanın inkişafı ilə birlikdə insanın müxtəlif mühitlərə uyğunlaşmasını öyrənə bilən ilk robot – “Sammie” hazırlanmışdır.
Hazırki dövrdə robotların istifadəsi insan həyatının bir çox hissəsində tətbiq edilir: yüksək temperaturlu, kimyəvi, nüvə əsaslı, insan sağlamlığını təhdid edən və s. proseslərdə robotların istifadəsi geniş vüsət almışdır [2, 3].

**Məqsəd**

Tədqiqatın məqsədi sənaye robotlarının növləri haqqında məlumat verib, onların proqramlaşdırılma və öyrənmə alqoritmlərinin işlənməsindən ibarətdir. Bu məqsədə çatmaqdan ötrü aşağıdakı ardıcıllıq gözlənilmişdir. Müxtəlif mənbələrə əsasən sənaye robotları və onların proqramlaşdırılmasının nəzəri və metodoloji əsasları öyrənmək. Robotların əsas təsnifləndirmə üsulu olan sərbəstlik dərəcəsinə görə təsnifləndirməyə uyğun olaraq sənaye robotlarının növləri haqqında nəzəri məlumatları təhlil etmək.
Sənaye robotlarının üstün və zəif cəhətlərini araşdırmaq və uyğun işçi mühitlərini təhlil etmək.
Sənaye robotlarının öyrənmə üsullarını araşdırmaq və onların müsbət və mənfi cəhətlərini təqdim etmək. Sənaye robotlarının işləməsi üçün lazım olan öyrənmə alqoritmini hazırlanması və təhlil edilməsi. Məlumdur ki, robotun özünə uyğunlaşdırılmış interfeys proqramı ilə robotun edəcəyi işlər, kompüter vasitəsi ilə proqramlaşdırılaraq robota yüklənir. İstehsalçıların özlərinin texnika və avadanlıqlara uyğunlaşdırılmış interfeys proqramları olur. Bu proqramlarda istifadə olunan komandaların sintaksı fərqli marka robotlar üçün fərqli olmaqdadır. Robotun iş görəcəyi sahə, edəcəyi hərəkətlər, bu hərəkətlərin ardıcıllığı və sürəti kimi ediləcəklər hamısı interfeys proqramı ilə proqramlaşdırılır. Yerinə yetirilməsi üçün tədqiqat işləri planlaşdırılmışdır.

**Metodlar**

Sənaye robotları ISO 8373 tərəfindən verilən sənaye robotunun tərifi: 3 və ya daha çox proqramlana bilən sərbəstlik dərəcəsinə sahib olan, avtomatik idarəolunan, proqramlanabilən, sabit və ya mobil növləri olan, istehsalat proseslərində tətbiq olunan manipulyatordur [1, 4].
Robot, müxtəlif işləri yerinə yetirmək üçün, yarımfabirkat material, detal və ya xüsusi alətləri proqramlanabilən hərəkətlər ilə daşımaq üçün nəzərdə tutulmuş, yenidən proqramlanabilən qurğudur.
Sənaye robotlarının istehsalı zamanı aşağdakı tələblər qoyulur:

1. Hər bir detalın istehsalına sərf olunan xərcin azaldılması
2. Təhlükəli mühitlərdə olan işçilərin iş prosesinin tam əvəz olunması
3. İstehsalatın sürətinin artırılması

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023

4. Daha yaxşı keyfiyyətə nəzarət
5. İstehsalatın uzun müddət fasiləsiz aparılması
6. İnsana nisbətən daha yüksək yükqaldırma qabiliyyəti
7. İnsana nisbətən iş prosesinin daha sürətli yerinə yetirilməsi
8. Dövrü işlərdə eyni effektivliklə işləmə qabiliyyəti
9. İnsan xətalarının aradan qaldırılması
10. Keyfiyyətə nəzarət zamanı xətaların minimuma endirilməsi
11. Yüksək hərəkət sərbəstliyi
12. Özünün diaqnostika sistemləri ilə təmin olunması
13. Digər avtomatik sistemlərlə uyğun işləmə və xəbərləşmə qabiliyyəti

Yuxarıda qeyd edilən üstün cəhətləri ilə yanaşı, sənaye robotlarının mənfi cəhətləri də mövcuddur;

1. Qərar qəbul edə bilməməsi
2. Yalnız özünə qabaqcadan tanıdılan obyektlərin tanınması
3. İşləməsi üçün proqram mövcudluğu tələbi
4. Hərəkət qabiliyyətinin məhdudluğu
5. Xüsusi və mürəkkəb diaqnostika və sazlama prosesi
6. Yüksək investisiya tələbi

Sənaye robotlarının müxtəlif formada təsnifləndirilir. Əsas təsnifləndirmə üsulu robotun hərəkət qabiliyyətindən asılıdır.

Kartezyen robotlar sadəcə tutma və daşıma funksiyasına sahib olan bu tip robotlar X, Y, Z oxları üzrə irəli və geri istiqamətdə düz xətt boyunca hərəkət edə bilir [5]. Sadə quruluşa sahib olduqları üçün onların hərəkətlərinin planlanması asandır. Şəkil 1-də də göründüyü kimi bu tip robotların işçi sahəsi kub və ya paralelopipet formada olub, robotun öz ölçülərindən balacadır. Ağırlıq mərkəzinin oynaqlara yaxın yerləşməsindən asılı olaraq yükqaldırma qabiliyyəti digər robotlara nisbətən yüksəkdir. İnsanın daşıya bilməyəcəyi yüklərin daşınmasında, yükləmə boşaltma proseslərində, zavodlarda ağır yüklərin daşınması üçün zavodların tavanlarında sıxlıqla bu tip robotlarla qarşılaşmaq mümkündür.




**Şəkil 1.** Kartezyen tipli robot qol

Kiçik yüklərin daşınmasında istifadə edilən robotların icra mexanizmləri pnevmatik olduğu halda, ağır yükləri hərəkətə gətirən robotlarda bu hissələr hidravlik olur. Hidravlik qollarda yağ sızdırma problemi ilə qarşılaşıldığından təmizliyin ön tələblərdən biri olduğu yerlərdə bu robotların

istifadəsi məqsədə uyğun deyildir. Bu səbəbdən hidravlik qollar elektrik motorları ilə əvəz olunmuşdur.
Silindrik robot qollar öz oxu ətrafında fırlana bilən gövdə və bu gövdədə yuxarı aşağı və irəli geri hərəkət edə bilən bir qoldan ibarətdir. Bu tip robotlar da hər 3 ox: X, Y, Z oxları üzrə sərbəst hərəkət edə biləcəyi silindrik bir işçi sahəsinə malikdirlər. İşçi sahənin böyüklüyü gövdənin hündürlüyü və qolun uzunluğundan asılıdır. Silindrik robot qolun quruluşu və işçi sahəsi şəkil 2-də göstərilmişdir. Sadə quruluşa sahib olduqlarından proqramlanması rahat, maddi dəyəri aşağıdır. Robotun daşıyacağı yükdən asılı olaraq robot pnevmatik, hidravlik və elektrik motoru əsaslı ola bilir. Bu tip robotları cismin müxtəlif hündürlükdə müxtəlif mövqelərə daşınması üçün, anbarlarda cisimlərin rəflərə yerləşdirilməsi və s. tip yerlərdə görmək mümkündür.




**Şəkil 2.** Silindrik robot qol

Dairəvi robot qollar iki ədəd öz oxu ətrafında fırlanma, bir ədəd irəli və geri hərəkət edə bilən toplamda 3 oynağa sahibdirlər. Quruluş cəhətdən silindrik robota oxşasalar da, işçi sahəsində hərəkət qabiliyyətinə görə silindrik robotlardan üstündürlər [8]. Dairəvi robot qolun işçi sahəsi şəkil 3-də göstərilmişdir. Kinematik quruluş cəhətdən mürəkkəb olduqları üçün onların hərəkət trayektoriyalarının proqramlanması və idarə edilməsi çətindir. İşçi sahənin böyüklüyü onu tərtib edən qolların ölçülərindən asılıdır. Bu tip qolların hərəkətə gətirilə bilməsi üçün əsasən elektrik motorları, pnevmatik və hidravlik qurğulardan istifadə olunur. Bu tip robotlar əsasən əymə, bükmə, videokameraların hərəkətə gətirilməsi üçün istifadə olunur.




**Şəkil 3.** Dairəvi robot qol

Scara robot qol iki oynağı elektrik motoru, bir oynağı isə pnevmatik qurğu ilə dəstəklənən robot qoldur. Elektrik motorları oynaqlara öz oxu ətrafında fırlanma hərəkətini təmin etdiyi halda, pnevmatik hissə qolun Z oxu üzrə irəli geri hərəkətini təmin edir. Bu da robot qola işçi sahəsində daha sərbəst hərəkət edə bilmə qabiliyyəti verir. Yüksək sürətə və koordinatlar üzrə sərbəst hərəkət qabiliyyətinə görə bu robot qolun istifadəsi əsasən elektron çap lövhələrinin hazırlandığı müəssəsələrdə elektron komponentlərin lövhə üzərinə yerləşdirilməsi üçün aktiv istifadə olunur. İşçi sahəsində sərbəst hərəkəti və istehsal maliyyəti aşağı olduğundan tutmaq və daşımaq məsələsində istifadə olunan ən optimal robot qol növüdür. Bu robot qolun quruluşu və işçi sahəsi şəkil 4-də göstərilmişdir [5-7].




**Şəkil 4**. Scara robot qol

Dirsəkli robot qollar insan qolunun hərəkətlərini ən yaxşı kopyalaya bilən robot qollardır. İstehsalatda digər tip qolların hərəkət qabiliyyəti limitli olduğundan dirsəklərin sayı əsasən 5-dən çox olur. Sərbəstlik dərəcələri ən yüksək olan robot qollardır. Bu tip robot qolların hər dirsəyi ayrı ayrılıqda idarə oluna bilən servo motor və ya addım motoru (step motor) ilə hərəkətə gətirilir. Bu sözü gedən motorlar həm sabit cərəyan, həm də dəyişən cərəyanla idarə olunur, bu isə həmin robot qolun ölçüləri və iş qabiliyyətinə qoyulan tələblərdən asılıdır. Dirsəkli robot qollar şəkil 5-də göstərilmişdir. Şəkillərdə də göründüyü kimi oynaqlara bağlanmış dirsəklərin hər biri X, Y, Z oxları üzrə sərbəst hərəkət etmə qabiliyyətinə malikdir. Bu tip robotlar işçi sahəsi içərisində verilmiş koordinatlara ən qısa məsafədən və ən qısa zamanda çatmaq qabiliyyətinə malikdirlər. Digər robot qollara nisbətən mürəkkəb quruluşa sahibdir və proqramlanması da nisbətən çətindir. Bu tip robotlar əsasən tutma və daşıma işlərində, yarımfabrikatların avadanlığa yerləşdirilməsində və hazırlanmış detalın avadanlıqdan götürülməsində, müxtəlif qaynaq işlərində və s. sahələrdə istifadə edilir. Tələb olunan işə görə robot qolun dirsəklərinin sayı seçilir. Nisbətən sadə işlərdə 3 və ya 4 dirsəkli robot qollar istifadə olunduğu halda, daha mürəkkəb işlərdə 6-8 dirsəkli robot qollardan istifadə olunur.




**Şəkil 5**. Dirsəkli robot qollar

Robotlarda hərəkət verici sistemlər əsasən servo motorlu sistemlər olaraq istifadə edilməsinə baxmayaraq, müxtəlif sahələrdə müxtəlif tələblərdən asılı olaraq servo motorlar müxtəlif tip hərəkətverici sistemlər ilə əvəz olunur.

Pnevmatik və hidravlik hissə

Bir çox robot tiplərində istifadə olunan pnevmatik hərəkət verici sistemlərin hazırlanma maliyyəti aşağı olmasına baxmayaraq, idarə edilməsi olduqca mürəkkəbdir. Sadə robot növlərində qolların hərəkətə gətirilməsi üçün istifadə olunsa da, daha böyük və ya dəqiqlik tələb olunan robotlarda tutucu hissələrdə istifadə olunur. İstehsalat sahələrinin demək olar ki hamısında təzyiqli hava olması pnevmatik sistemlərin istifadəsini artırır.

Robot sənayesinin ilk başlarında bu tip hərəkət verici sistemlərin istifadəsi geniş yayılmış olmasına baxmayaraq, zaman keçdikcə bu hərəkət verici sistemlər öz yerini elektrik motorlarına

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023

verdi. Lakin daha böyük ölçülərə malik və ya daha yüksək yükqaldırma qabiliyyəti tələb olunan robotlarda hidravlik hərəkət verici sistemlər hələ də istifadə olunur. Buna səbəb hidravlik hərəkət verici sistemlərdə əldə edilən gücün elektrik motorları vasitəsi ilə alınmasının qeyri-mümkün olması və ya çox yüksək maliyyət tələb olunmasıdır. Lakin aşağı sürətlərdə işləməsi və olduğu yeri yağ sızdıraraq çirkləndirməsi bu tip hərəkətverici sistemlərin mənfi cəhətləridir.
Elektrik motorları

- DC Servo motorlar Koordinat və sürət idarəsinin funksionallığı və sadəliyi bu tip hərəkət verici sistemlərin istifadəsinin əsas səbəbidir. Lakin hazırlanmasına tələb olunan maliyyət və texniki baxış maliyyəti yüksəkdir. Bu səbəbdən də robot qollarda digər tip elektrik motorları daha çox təsadüf olunur.
- AC Servo motorlar Elektronikanın və avtomatikanın inkişafı ilə bu tip robotlar koordinatlama və sürət məsələsində irəliləyişi nəticəsində DC Servo motorların yerini almışdır. AC Servo motorların üstün cəhəti texniki baxış maliyyətinin aşağı olması, daha səssiz işləməsi və daha uzun ömürlü olmasıdır.
- Step Motorlar Servo motorlara nisbətən həm motorların özləri həm də sürücüləri çox daha aşağı maliyyət xərci tələb etdiyindən bu tip motorların istifadəsi sadə, balaca ölçülərə sahib olan robotlarda və ya daha böyük robotların tutucu hissələrində geniş vüsət almışdır. Mənfi cəhətləri daha aşağı sürətlərdə işləməsi, yük altında isinmə problemi və dolayı olaraq güc itkisi, servo motorlara nisbətən səsli işləməsidir.

Robotların proqramlaşdırılması Robotların düzgün işləməsi onun proqramlaşdırılmasından asılıdır. Bunun üçün istifadə olunan iki üsuldan biri öyrətmə üsuludur (ing. teaching pendant ) ki, Britaniya Avtomatlaşdırma və Robot Assosiasiyasının məlumatına görə robotların 90% -dən çoxu bu şəkildə proqramlaşdırılıb. Digər üsul interfeys proqramı ilə proqramlaşdırmadır [3]. Öyrətmə üsulu Bunun üçün şəkil 6-da göstərildiyi kimi operator düymələrdən istifadə edərək robotu bir nöqtədən digərinə hərəkət etdirir və ayrı – ayrılıqda bütün nöqtələri yadda saxlanılır və hansı nöqtədə necə işləməli olduğu proqramlaşdırılır, proqram tamamlandıqda robot bu hərəkətlərin hamsını yerinə yetirə bilir.




**Şəkil 6**. Öyrətmə üsulu ilə proqramlaşdırmanın təsviri

İnterfeys proqramı ilə proqramlaşdırma Robotun özünə uyğunlaşdırılmış interfeys proqramı ilə robotun edəcəyi işlər, kompüter vasitəsi ilə proqramlaşdırılaraq robota yüklənir. İstehsalçıların özlərinin texnika və avadanlıqlara uyğunlaşdırılmış interfeys proqramları olur. Bu proqramlarda istifadə olunan komandaların sintaksı fərqli marka robotlar üçün fərqli olmaqdadır. Robotun iş görəcəyi sahə, edəcəyi hərəkətlər, bu hərəkətlərin ardıcıllığı və sürəti kimi ediləcəklər hamısı interfeys proqramı ilə proqramlaşdırılır [4].

Ümumi olaraq bir robotun proqramlanması üçün şəkil 7-dəki kimi alqoritimdən istifadə olunur:




Robotun nə edəcəyini qərar vermək. Hansı trayektoriya ilə hərəkətinə və mövqelərinə həmçinin bu vəziyyətlərdə tutucu qolun açıq və ya bağlı olacağına qərar vermək.

**Şəkil 7**. Robot proqramlaşdırma alqoritmi

Robota trayektoriyaları öyrətmək və mövqeləri adlandırmaq.
Əsas əməliyyatlar, mövqelər əmrlər ilər proqramlaşdırılması və əmrlərin funksiyaların izahları verilərək, yaddaşda saxlanması
Robot qoluna mövqelərə hərəkəti və dəyişənləri öyrətmək.
Proqramı addım-addım yoxlamaqla, proqramı düzəltmək və uyğun mövqeləri (trayektoriyaları) təsdiqləyərək yadda saxlamaq.
Robotun işləməsində bir səhv taparsa, proqram yenilərək düzəldilir.
Robotun işləməsində səhv mövqe (trayektoriya) olarsa, düzgün mövqelərin öyrədilməsi.
Robotun avtomatik işləməsi təmin edilərək, proramın sonlandırılması.
Sənaye avtomatikasının inkişafının ən son nəticələrindən biri olan sənaye robotları, bir çox iş sahəsində insan əməyini əvəz etməsi, təhlükəli mühitlərdə işləmə qabiliyyəti və istehsalat gücünün yüksək olması ilə sənayenin əsasını təşkil edir. Sənaye robotları istehsalatda insan əlaqəli xətaları aradan qaldırmaqla yanaşı istehsalatın keyfiyyətinin də yüksəldilməsini təmin edir. Hazırlanması, quraşdırılması və istifadəsinin yüksək maddi tələblərə sahib olmasına baxmayaraq, yüksək verimliliyə sahib olması onların istifadəsinin genişliyinə gətirib çıxarır.

## Nəticə

Robotların iş prinispləri araşdırılmış, müasir robotların proqram təminatlarınmın tərtib olunması və s. tədqiq edilmişdir. Bizim tərəfimizdən robotların işinin təyin olunması üçün alqoritm tərtib olunmuşdur. Alqoritmə əsaslanaraq python proqramlaşdırma dilində robotun işinin təşkil olunması üçün proqram tərtib edilmişdir.

## ƏDƏBİYYAT

1. R. Alami, R. Chatila, S. Fleury, M. Ghallab M., and Ingrand F. An architecture for autonomy. //Int. J. of Robotics Research.- 2018, 17(4):315–337,
2. Gerkey B.P., R.T. Vaughan, and A. Howard. The Player/Stage project: Tools for multi-robot and distributed sensor systems./ In Proceedings of the International Conference on Advanced Robotics, ICAR’03, Coimbra, Portugal.- 2017, pp. 317–323.
3. Bakkaloğlu, A. “Robotların Endustriyel Uygulamaları” .//“Makina-Metal” jurnalı.-2001, No: 114,
4. Güzel, M. S. “Altı eksenli robot kolun hareketsel karakteristlikinin gorsel programlanması ve gerchek zamanlı uygulamalar”.- Ankara: Ankara Universiteti, 2008.
5. Orhan Efe Alp. “Genel amachlı robot kolu tasarımı” .-İzmir: Dokuz Eylül Universiteti, 2012.
6. Tiryaki, A. və Kazan, R. “Scara robot dinamiğinin yapay sinir agları kullanarak modellenmesi.” //“Mühendis ve Makine” jurnalı.- 2005.
7. Bruyninckx H., P. Soetens, and B. Koninckx. The real-time control core of the OROCOS project. /In Proceedings of the IEEE International Conference on Robotics and Automation, Taipei, Taiwan, pages 2766–2771. -September, 14–19 2021.
8. Winiarski T. and Zieliński C. Implementation of position-force control in MRROC++. /In Proceedings of the 5th International Workshop on Robot Motion and Control, RoMoCo’05, Dymaczewo.- Poland, 2015, p. 259–264.

## РАЗРАБОТКА РОБОТ-РУК С СИСТЕМОЙ УПРАВЛЕНИЯ

**Азер Мамедов[1], Эльджан Алиев[2], Видади Мехтиев[3], Рахиб Гусейнов[4], Ниджат Мехдизаде[5]**
[1,2,3,4]Азербайджанский государственный университет нефти и промышленности,
[1,2,3,4]кафедра «Электроника и автоматика»,
[5] Азербайджанский технический университет, [5]кафедра «Мехатроника и машиностроение».
[1]профессор, Email: azer.mammadov@asoiu.edu.az
[1,2,3,4,5] магистрант, Email: [2]elcaneliyev20@outlook.com, Email: [3]vidadimehdiyev@gmail.com

### РЕЗЮМЕ

При изучении производственных систем развитых стран видно, что широко используются автоматические производственные системы. Значение промышленных роботов, составляющих основу автоматических производственных систем, возрастает день ото дня. Страны, где промышленные роботы активно используются в производстве, более конкурентоспособны, чем другие страны. По этой причине разработка промышленных роботов получила широкое распространение.

Основное преимущество использования роботов в производственных процессах заключается в том, что уровень качества выпускаемой продукции в непрерывных производственных процессах не меняется в зависимости от времени. Уровень качества выпускаемой продукции является одним из основных вопросов как для зарубежных, так и для отечественных предприятий. Роботы имеют различные типы классификации в

зависимости от сложности работы, которую они должны выполнять, в соответствии с их структурной структурой, степенями свободы и размером рабочей зоны. В статье представлена общая информация о наиболее используемых типах промышленных роботов, а также рассмотрены их параметры и характеристики.
В статье были рассмотрены общие сведения о наиболее используемых типах промышленных роботов, а также рассмотрены их параметры и характеристики. Были отмечены области их применения и исследованы принципы работы. Были отмечены области их применения и исследованы принципы работы. Упоминаются методы обучения, используемые в программировании роботов, и предоставляется подробная информация о них. Разработан и объяснен необходимый алгоритм управления роботами.
Целью исследования является предоставление информации о типах промышленных роботов, а также разработка алгоритмов их программирования и обучения. Для достижения этой цели предполагается следующая последовательность. На основе различных источников изучены промышленные роботы и теоретико-методологические основы их программирования.
**Ключевые слова**: промышленные роботы, система управления, роботы-манипуляторы, управление, программирование роботов.

Publication history

Article received: 06.02.2023
Article accepted: 20.02.2023
Article published online: 14.03.2023
DOI suffix: 10.36962/PAHTEI26032023-21

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023 32-38

# NEW TECHNOLOGY FOR THE PROCESSING OF CARBOHYDROGEN GASES

**Arifa Karimova[1], Jeyhun Sadigov[2]**
[1,2] Azerbaijan State Oil and Industry University, [1,2] Department of "Transportation and Storage of Oil and Gas"
[1] Doctor of philosophy in technology, associate professor, Email: arifa.karimova@asoiu.edu.az
[2] Master degree, Email: ceyhunsadiqov@hotmail.com

## ABSTRACT

Due to the increasing demand for oil and oil products in the development process of the world, the depletion of oil reserves after many years of operation, and the sharp increase in the price of oil products, researchers and producers began to look at natural gas as an alternative hydrocarbon raw material. Explored natural gas reserves far exceed those of black gold. In addition, natural gas can be attributed to renewable energy sources and raw materials with some caution. The main components of natural gas - methane and ethane - are formed during bacterial fermentation of plant and animal biomass.

Despite all this, the level of processing of natural gas into automotive fuel and valuable chemical products remains low, a significant part of which is burned in flares, which causes irreparable loss of valuable raw materials and creates complex environmental problems in the regions. Currently, natural gas is mainly used in heat and electricity production processes.

Given that hydrocarbon resources are depleting, such a wasteful attitude is unacceptable, and one of the important issues is the immediate creation of new technologies for the processing of light hydrocarbon raw materials.

As the range of technical and economic indicators of natural gas was determined, its consumption directions also changed. As a result of researches, it has been shown that gas is a very convenient raw material for domestic and industrial consumption as a fuel. In addition to the mentioned advantages of natural gas, the richness of its composition and the purchase of various synthetic substances from it - liquid alcohol, fertilizers, organic solvents, plastic materials and many substances widely used in industry have been determined. The use of natural gas in energy and other fields of national economy has become widespread. In addition to its environmental benefits as a fuel raw material, natural gas differs from other hydrocarbon resources due to its technical and economic capabilities and energy density. It is attractive from an environmental point of view, as it does not create a sensation when burning, does not create waste, easily manages the torch, and in this regard, the damage to the atmosphere and the environment is very little.

In addition to natural gas, the composition of the gases that come out with it during the exploitation of oil is distinguished by its richness. Despite the fact that the funds spent for the purchase of natural gas are almost 2 times less than the capital invested in purchasing natural gas, the oiliness of the products obtained from natural gas is 2 times higher. Ethane, propane-butane and pentane obtained during the fractionation of neutral gases are richer than natural gases. Taking into account these indicators, it is possible to evaluate the gas as a valuable raw material in various fields of industry. Oxytocin is often burned in flares. However, using new technologies, it is possible to take advantage of the quality shades of natural gas.

**Keywords:** hydrocarbon reserves, gas processing, methane-ethane, plasma chemistry technology.

E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023
ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

# KARBOHİDROGEN QAZLARININ EMALI ÜÇÜN YENİ TEXNOLOGİYA

**Arifə Kərimova[1], Ceyhun Sadiqov[2]**
[1,2]Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
[1,2]Neftin, qazın nəqli və saxlanılması kafedrası
[1]Texnika üzrə fəlsəfə doktoru, dosent, Email: arifa.karimova@asoiu.edu.az
[2]magistr, Email: ceyhunsadiqov@hotmail.com

## XÜLASƏ

Məqalə karbohidrogen qazlarının yeni texnologiyanın tətbiqi ilə iqtisadi cəhətdən səmərəli və sənaye əhəmiyyətli emalı proseslərinə həsr olunub.
Dünyanın inkisaf prosesində neft və neft məhsullarına olan tələbatın artması, uzun illər istismar müddətindən sonra neft ehtiyatlarının tükənməsi və neft məhsullarının kəskin bahalaşması fonunda tədqiqatçılar və istehsalçılar təbii qaza alternativ karbohidrogen xammalı kimi baxmağa başladılar. Tədqiq olunmuş təbii qaz ehtiyatları qara qızılın ehtiyatlarını xeyli üstələyir. Bundan əlavə, təbii qazı müəyyən ehtiyatla bərpa olunan enerji mənbələrinə və xammala aid etmək olar. Təbii qazın əsas komponentləri - metan və etan - bitki və heyvan mənşəli biokütlənin bakterial fermentasiyası zamanı əmələ gəlir.
Bütün bunlara baxmayaraq, təbii qazın avtomobil yanacağına və qiymətli kimya məhsullarına emalı səviyyəsi aşağı səviyyədə qalır, onun mühüm hissəsi məşəllərdə yandırılır ki, bu da qiymətli xammalın əvəzsiz itkisinə səbəb olur və regionlarda mürəkkəb ekoloji problemlər yaradır. Hazırda təbii qazdan əsasən istilik və elektrik enerjisi istehsalı proseslərində istifadə olunur.
Karbohidrogen ehtiyatlarının tükənən olduğunu nəzərə alsaq, belə israfçı münasibət yolverilməzdir və yüngül karbohidrogen xammalının emalı üçün dərhal yeni texnologiyaların yaradılması mühüm məsələlərdən biridir.
Təbii qazla yanaşı, neftin istismarı zamanı onunla birlikdə çıxan qazların tərkibi də zənginliyi ilə seçilir. Təbii qazın alınmasına sərf olunan vəsait təbii qazın alınmasına qoyulan kapitaldan təxminən 2 dəfə az olmasına baxmayaraq, təbii qazdan alınan məhsulların neftliliyi 2 dəfə yüksəkdir. Bu göstəriciləri nəzərə alaraq qazı sənayenin müxtəlif sahələrində qiymətli xammal kimi qiymətləndirmək mümkündür. Oksitosin tez-tez alovlarda yandırılır. Bununla belə, yeni texnologiyalardan istifadə etməklə təbii qazın keyfiyyətli çalarlarından yararlanmaq mümkündür.
**Açar sözlər:** karbohidrogen ehtiyatları, qaz emalı, metan-etan, plazmokimya texnologiyası.

## Giriş

Azərbaycan neft resurslarına görə qədim zamanlardan bütün dünyanın diqqətini cəlb eləmişdir. Müasir dövrdə kəşf olunan və istismar olunan qaz yataqları Azərbaycanın nüfüzunu daha da ön plana çəkdi.
Azərbaycan Respublikası Energetika Nazırliyinin hesabatına əsasən 2022-ci ilin 10 aylıq dövrdə, Azərbaycanda 38,4 milyard kubmetr təbii qaz hasil edildiyi qeyd olunub. Çıxarılan qazın diaqramda qeyd olunduğu kimi 11,1 milyard $m^3$ “Azəri-Çıraq-Günəşli”nin, 20,7 milyard $m^3$ “Şahdəniz”in, 6,6 milyard $m^3$ isə SOCAR-ın payına düşür. Ötən ilin 10 aylıq göstəriciləri ilə müqayisə etsək 7,3 faiz, yəni 2,6 milyard $m^3$ çox qaz çıxarılıb.
2022-ci ilin 10 aylıq dövründə xaricə qaz satışı 18,2 milyard $m^3$ qaz satışı həyata keçib ki, bu da ötən ilin 10 aylıq göstəriciləri ilə müqayisədə 17,4 faiz çoxdur. [6]







İllik istehsal gücü 650-660 min ton karbamid məhsulu olan Karbamid zavodunun əsası 2011-ci ildə qoyulmuşdur. Göstərilən miqdarda karbamid məhsulu üçün 435 milyon m³ təbii qazdan xammal kimi istifadə olunur. Azotla zəngin (46.3%) və suda asan həllolma keyfiyyətlərinə görə fərqlənən bu gübrə ammonyak və karbon dioksidin sintezi nəticəsində alınır. Burada hasil edilən təbii qaz xammal rolunu oylayır, yerli məhsuldur. Yəni, karbamidin istehsalında təbii qazdan başqa əlavə komponentlərdən istifadə olunmur. Təbii qazın bugünkü satış qiymətləri ilə xarici bazarlara satışından əldə edilən gəlir təxmini olaraq 80 milyon dollardır. Lakin istehsal olunan karbamid gübrəsi şəklində məhsulun dəyəri xammalın satışından əldə olunan vəsaitdən 2 dəfə çox, təqribən 150-160 milyon dollar olacaqdır. Buradan belə nəticəyə gəlmək olar ki, təbii qazın emalından nəticəsində əldə olunan məhsuların əldə olunan gəlir hasil edilən təbii qazın satışı gəliri ilə müqayisədə daha çoxdur. Lakin bu hesabatdan məlum olur ki, emal edilən qaz hasil edilən qazın sadəcə 2,15%-ini təşkil edir. [7]

**Məqsəd**

Aparılmış tədqiqatın əsas məqsədi təbii və səmt qazının emal prosesində yeni texnologiya olan pzamokimya texnologiyasının hal-hazırda istifadə olunanan digər texnologiyardan iqtisadi cəhətdən və geniş imkanlarına görə daha səmərəli olduğunu göstərməkdir.

Təbii qazın əsas komponenti olan metanın termodinamik dayanıqlığı metanol, ammonyak və hidrogen istehsalı kimi sənayedə həyata keçirilən genişmiqyaslı təbii qazın emalı proseslərinin yüksək enerji və kapital tutumluluğunu müəyyən edir. Səmt qazının və təbii qazın maye karbohidrogenlərə çevrilməsinin ənənəvi, termal katalitik üsulu (Fişer-Tropş üsulu) 600-700°C temperaturda və 4-10 MPa iş təzyiqində həyata keçirilir, buna görə də enerji tutumlu və böyük kapital xərcləri tələb edir. Səmt qazının və təbii qazın emalı üçün texnoloji qurğuların çəkisi on minlərlə ton təşkil edir ki, bu da onların çatdırılmasını, quraşdırılmasını və neft-qaz yataqlarının ərazilərində istismarını çətinləşdirir.

Metan, qiymətli kimyəvi məhsulların istehsalı üçün ən böyük maraq kəsb edən komponentlərdən biridir. Təbii qazın tərkibinə yataqdan asılı olaraq 55%-dən 99%-ə qədər metan daxildir. Metanın çevrilməsi üçün nəzəri imkanların müxtəlifliyinə baxmayaraq son vaxtlar aşağıdakı proseslər ən çox maraq doğurur:

- sintez qazının alınması;
- metanın etilenə birbaşa katalitik çevrilməsi –metanın oksidləşdirici kondensasiyası;

- metanın oksigen tərkibli məhsullara birbaşa katalitik oksidləşməsi – spirtlər və formaldehid.

Metanın çevrilməsinin ən cəlbedici üsulu oksidləşdirici kondensasiyadır. Bu proses katalitikdir və 700°C-dən yuxarı temperaturda davam edir. Hazırda metanın oksidləşdirici kondensasiyası üzrə tədqiqat işləri başa çatdırılmışdır: reaksiya mexanizmləri öyrənilmiş, müxtəlif katalizatorlar tədqiq edilmiş və onlardan ən effektivi təklif edilmişdir. Bununla belə, proses hələ də praktiki həyata keçirməkdən uzaqdır.

Hazırda səmt və təbii qazın emalı üzrə tədqiqatlarda yeni bir istiqamət yaranmışdır ki, bu da doymuş karbohidrogenlərin çevrilməsi prosesinin çətinliklərini aradan qaldırmağa, səmt və təbii qazın kimyəvi emalı üçün bütün ilkin şərtləri yaratmağa imkan vermişdir.

Bu sahədə çalışan bir qrup alim karbohidrogen qazlarının emalı üçün prinsipcə yeni plazmokimya texnologiya yaratmışlar ki, bunun nəticəsində çoxlu qiymətli kimyəvi məhsullar, o cümlədən dizel yanacağı, yüksək oktanlı benzin, yüksək-oktanlı yanacaq komponentləri, etilen, propilen, oksigen tərkibli karbohidrogen məhsulları, olefin karbohidrogenləri və irimiqyaslı üzvi sintez üçün digər növ xammallar əldə olunmuşdur.

Yeni texnologiya elektrofiziki təsirin maksimum konsentrasiyasını təmin etməyə imkan verən şüa-plazma, elektrik boşalması və mikrodalğalı təsir üsullarına əsaslanan karbohidrogen çevrilməsinin plazmokimya prosesləri sahəsində fundamental elmi tədqiqatların nəticələrinə əsaslanır. Yeni texnologiya ilə qurulmuş emalı zavodu səmt və təbii qazları, həmçinin bioqazı emal edə bilər.

Karbohidrogen qazlarının plazmokimya emalı üçün qurğular həm neft-qaz yataqlarında, həm də neft-qaz emalı zavodlarında birbaşa istifadə oluna bilər. Həmçinin plazmokimya texnologiyadan istifadə etməklə emalı zavodunda mayeləşdirilmiş karbohidrogen və təbii qazların propan-butan fraksiyası uğurla emal edilə bilər.

**Metodlar**

Karbohidrogen qazlarının emalı üçün bəhs edilən plazmokimya texnologiyasının əməliyyat prinsipi aşağıdakı kimidir.

İlkin olaraq təmizlənmiş karbohidrogen qazı davamlı qarışdırıcıya verilir, burada karbohidrogen qazı və oksidləşdiricidən ibarət reaksiya qarışığı hazırlanır. Təmizlənmiş atmosfer havası oksidləşdirici maddə kimi istifadə olunur. Reaksiya qarışığının emalı polad şaquli sütun tipli avadanlıq olan plazmokimya reaktorda aparılır. Reaktorun qabına tələb olunan hündürlükdə stasionar katalizator yatağı yerləşdirilir. Ətraf mühitin temperaturunda və atmosfer təzyiqində reaksiya qarışığı yuxarıdan sütuna bərabər şəkildə verilir. Katalizatorun həcmində diffuziya elektrik boşalması yaranır və bütün katalizator təbəqəsini bərabər şəkildə doldurur. Boşalma generatordan verilən yüksək gərginlikli gərginlik impulsları ilə başlanır. Katalizator təbəqəsinə daxil olan reaksiya qarışığı tarazlıqda olmayan elektrik boşalması plazmasının güclü elektrofiziki təsirinə məruz qalır. Reaktorda gedən plazmokimya proseslər nəticəsində karbohidrogen qazının üzvi sintezin son məhsullarına yüksək sürətlə çevrilməsi baş verir. Reaksiya nəticəsində ayrılan istilik davamlı olaraq su ilə soyudulmuş sarğı vasitəsilə reaksiya zonasından çıxarılır. Karbohidrogen buxarları reaktorun soyudulmuş səthlərində kondensasiya olunur. Yaranan kondensat aşağı toplanır və bununla da reaksiya məhsullarının atqı zonasından sürətlə çıxarılmasını təmin edir. Kondensat sütunun aşağı zonasında toplanır və hazır məhsulun hazırlanmasının növbəti mərhələsinə göndərilir.

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023

Karbohidrogen qazlarının emalının plazmokimya texnologiyası üçün xüsusi polifunksional katalizator yaradılmışdır ki, bu da bir mərhələdə karbohidrogen xammalı ilə eyni vaxtda 4-ə qədər reaksiya aparmağa imkan verir.
Plazmokimya texnologiya ilə karbohidrogen qazlarından əldə edilən sintetik motor yanacaqları ekoloji cəhətdən təmizdir. Onların tərkibində kükürd komponentləri, kanserogen poliaromatik karbohidrogenlər yoxdur. Dizel yanacağı yüksək setan sayına malikdir (>65), bu da mühərrikin işləməsi üçün çox vacibdir.
Yeni üsulla karbohidrogen qazlarından sintetik motor yanacağının istehsalı neftdən alınan analoji mühərrik yanacağı ilə müqayisədə onun maya dəyərini orta hesabla 3-5 dəfə aşağı salmağa imkan verir.
Plazmokimya texnologiyadan istifadə etməklə səmt və təbii qazların emalı üçün kompakt bloklu zavodların birbaşa neft-qaz yataqlarında da istifadəyə verilməsi mümkündür. Neft-qaz yataqlarından neft emal zavodlarına kimi yanacağın çatdırılması üçün hər il külli miqdarda pul xərcləməyə ehtiyac qalmayacaq – lazımi benzin və dizel yanacağını karbohidrogen qazlarının utilizasiyası hesabına əldə etmək olar.
Nəticədə, qaz sənayesi müəssisələrində plazma-kimya texnologiyasının tətbiqi karbohidrogen qazlarının ekoloji cəhətdən təmiz, yüksək rentabelli məhsullara emalı üzrə böyük tutumlu istehsalın yaradılmasına zəmin yaradacaq və istehsal olunan məhsulun transformasiyasına töhfə verəcək.

**Nəticələrin müzakirəsi**
Aparılmış tədqiqatlara əsaslanaraq, plazmokimya prosesləri digər emal texnologiyaları ilə nisbətdə yüksək məhsuldarlığı ilə seçilir. Metan plazmotronu 65 sm uzunluğu və 15 sm diametri olmasına rəğmən gündə 75 ton asetilen istehsal etmə gücünə malikdir. Bu isə bir zavodun istehsalının həcminə bərabərdir. 3000-35000C intervalında saniyənin mində biri müddətində metan 80%-i asetilenə çevrilir və enerjinin 90-95%-indən istifadə olunur. 1 kq asetilnə enerji sərfi 3 kvt.saatdır. Plazamokimya texnologiyası ilə nisbətdə metanın buxar reaktorunda pirolizinin enerji sərfi bundan iki dəfə çoxdur. [6]
Plazmokimya emal texnologiyası benzinin, dizel yanacağının və digər hədəf məhsulların məhsuldarlığının eyni vaxtda artması ilə qazın emalının maya dəyərini əhəmiyyətli dərəcədə sadələşdirməyə və azaltmağa və keyfiyyətini yaxşılaşdırmağa imkan verir.
Bu və digər parametrlərin birləşməsi baxımından karbohidrogen qazlarının emalı üzrə plazmokimya texnologiyanın dünya analoqu yoxdur. Sonda qeyd etmək lazımdır ki, yeni texnologiyanın əsas texnoloji prosesləri artıq sınaq zavodlarında tədqiq edilmiş və sınaqdan keçirilmişdir.

**Nəticə**
1. Yeni texnologiya qiymətli kimyəvi məhsulların sintezi prosesləri üçün enerji xərclərini azaldır, bunun sayəsində əsaslı və əməliyyat xərcləri ənənəvi texnologiya ilə müqayisədə orta hesabla 10 dəfə azalır.
2. Texnologiyaya əsasən həm bilavasitə neft və qaz yataqlarının ərazilərində istifadə üçün nəzərdə tutulmuş modul tipli yığcam sənaye plazma kimyası zavodları, həm də emal edən qaz kimyası müəssisələrinin modernizasiya və yenidən qurma işləri ilə sənaye plazma kimya zavodları təbii qazdan qiymətli kimyəvi məhsullara alınma prosesini həyata keçirə bilər.

## ƏDƏBİYYAT


1. Dilqem Taghıyev, Asif Mammadov. "Geleceyin kimyası".– 2019, səh.339
2. Nimir O. Elbashir , Mahmoud M. El-Halwagi , Ioannis G. Economou , Kenneth R. Hall Natural Gas Processing from Midstream to Downstream –2019, s.264
3. V.M. Abbasov, H.C. İbrahimov, S.R. Hacıyeva, S.A. Mammadxanova, E.Sh. Abdullayev, F.A. Amirov - Neft və qaz emalı proseslerinin kimyası və texnologiyası.-2014 , s.141-151
4. V.A. Odaryuk, S.YA. Tronin. Plazmohimicheskie tekhnologii ochistki promyshlennyh stochnyh vod, gazovyh vybrosov, pererabotki nefti, tverdyh bytovyh othodov (TBO) i promyshlennyh othodov.- 2014, s.49.
5. E.M.Hacızade. Azerbaycanın tebıı qaz potensıalı: reallıqlar və vırtual cızgıler.- 2010, s.14
6. https://minenergy.gov.az/az/xeberler-arxivi/10-ayda-olkede-73-faiz-artimla-qaz-hasil-edilib
7. https://socar.az/az/page/karbamid-zavodu2


# НОВАЯ ТЕХНОЛОГИЯ ПЕРЕРАБОТКИ УГЛЕВОДОРОДНЫХ ГАЗОВ

**Арифа Каримова[1], Джейхун Садыгов[2]**
[1,2]Азербайджанский государственный университет нефти и промышленности
[1,2]кафедра “Транспорт и хранение нефти, газа”
[1]кандидат технических наук, доцент, Email: arifa.karimova@asoiu.edu.az
[2]Магистр, Email: ceyhunsadiqov@hotmail.com

## РЕЗЮМЕ

Статья посвящена экономически эффективным и промышленно важным процессам переработки углеводородных газов с применением новой технологии.
В связи с возрастающим спросом на нефть и нефтепродукты в процессе развития мира, истощением запасов нефти после многих лет эксплуатации и резким ростом цен на нефтепродукты исследователи и производители стали смотреть на природный газ как на альтернативное углеводородное сырье. Разведанные запасы природного газа намного превышают запасы черного золота. Кроме того, природный газ можно с некоторой осторожностью отнести к возобновляемым источникам энергии и сырью. Основные компоненты природного газа - метан и этан - образуются при бактериальном брожении растительной и животной биомассы.
Несмотря на все это, остается низким уровень переработки природного газа в автомобильное топливо и ценные химические продукты, значительная часть которых сжигается на факелах, что приводит к безвозвратным потерям ценного сырья и создает сложные экологические проблемы в регионах. В настоящее время природный газ в основном используется в процессах производства тепла и электроэнергии.

В условиях истощения углеводородных ресурсов такое расточительное отношение недопустимо, и одним из важных вопросов является безотлагательное создание новых технологий переработки легкого углеводородного сырья.
**Ключевые слова:** запасы углеводородов, переработка газа, метан-этан, плазмохимическая технология.

Publication history

Article received: 06.02.2023
Article accepted: 20.02.2023
Article published online: 14.03.2023
DOI suffix: 10.36962/PAHTEI26032023-32

E-ISSN: 2674-5224
39-47 VOLUME 26 ISSUE 03 2023
ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

# IMPACT OF INNOVATIONS ON COMPETITIVENESS IN INDUSTRIAL ENTERPRISES

**Bagish Ahmadov[1], Ali Abishov[2]**
[1,2] Azerbaijan State University of Economics
[1,2] Department of Economics and Technological Sciences
[1] Docent, Candidate of economic sciences, Email: bahmadov@gmail.com
[2] Master student, Email: abishovali13@gmail.com

## ABSTRACT

Innovation is a key driver of competitiveness in today's rapidly changing business environment. Companies that are able to innovate successfully can enjoy a range of benefits, including increased revenue, improved efficiency, reduced costs, and greater agility and resilience in the face of uncertainty. Innovation can help companies to differentiate themselves from their competitors, meet evolving customer needs and preferences, and stay ahead of market trends. By fostering a culture of experimentation and risk-taking, and investing in new ideas and technologies, companies can create new or improved products, services, and processes that provide a competitive advantage in the market. Innovation can also have broader social and economic benefits, driving job creation, promoting economic growth, and improving quality of life. Overall, the effect of innovation on competitiveness is significant, and companies that prioritize innovation are better positioned to succeed in today's fast-paced business environment

Innovation can be achieved in a variety of ways, including through research and development, collaboration with partners and customers, and the use of new technologies. However, successful innovation requires a culture of openness and collaboration, where ideas can be shared freely and feedback is encouraged.

Innovation can also help companies to build stronger relationships with customers by providing unique value propositions and experiences. For example, a company that develops a new service or product that meets an emerging need may be able to attract and retain customers who are looking for something new or different. Companies that prioritize innovation often invest in training and development programs for their employees, providing them with the skills and resources needed to generate new ideas and turn them into successful products, services, or processes.

Innovation can also drive growth and expansion by enabling companies to enter new markets, reach new customers, and create new revenue streams. For example, a company that develops a new product that meets an emerging need may be able to capture market share from its competitors and grow its customer base. Similarly, a company that creates a new process that increases efficiency and reduces costs may be able to pass those savings on to its customers, making it more competitive in the market.

Innovation can also have a positive impact on society as a whole, by creating new jobs and driving economic growth. For example, a company that develops a new technology may be able to create new jobs in research and development, manufacturing, sales, and support services. Similarly, a company that introduces a new product may be able to create jobs in marketing, distribution, and customer service. Innovation is not without its challenges, however. Developing and implementing new ideas can be costly and time-consuming, and there is always a risk that an

xüsusiyyətindən dolayı rəqəmsal marketinq mühitində şirkətlər tərəfindən istifadəçidən istifadəçiyə edilən reklam və kampaniyaların köçürülmələri həyata keçirilir. Həmçinin mövcud vəziyyətdən yararlanan şirkətlər daha çox insanın məhsul haqqında müsbət düşünməsini təmin etməyə çalışır. Danışıq marketinqi aparılarkən hər bir istehlakçı digər istehlakçıya təsir etmək potensialına malikdir. Rəqəmsal mühitlərdə müəssisələrin məhsulu haqqında nə qədər müsbət fikirlər varsa, istehlakçıların bir o qədər çox olacağı ideyası mövcuddur. Danışıq marketinqinin strukturunu hörümçək toru kimi təsəvvür etmək mümkündür. Danışıq marketinqin uğurunun ən mühüm səbəbi istehlakçıların bir xidmət və ya məhsulu araşdırarkən müxtəlif istehlakçıların fikirlərinə etibar etmələridir. Danışıq marketinqdə əsas məqsəd məhsullarından razı qalan müştərilərin məmnuniyyətini digər istehlakçılara da çatdırılmasıdır. Danışıq marketinqi həm internetresurslarından istifadəsi, həm də elektron kommunikasiya vasitəsi ilə insanlarla əlaqə yarada bilməsi baxımdan digər marketinq üsullarından daha sürətli yayılma xüsusiyyətinə malikdir. Məhz bu xüsusiyyətlərdən dolayı də danışıq marketinqi bir çox müəssisələrin əsas marketinq strategiyası olması həddinə çatmışdır (Thompkins, 2018; s.465). Markalara böyük təsir göstərən danışıq marketinqinə nümunə olararaq “OldSpice” bədən geli firmasını göstərə bilərik. Bu reklam kampaniyası ilə ilk dəfə televiziyada yayınlandıqdanüç ay sonra 55% artışgöstərmişdir. Bu uğurdan sonra həmin şirkət daha sonra hazırladığı videolarla bu nisbəti 107%-ə qədər yüksəltmişdir. Həmin marka əvvəlcə TV-də güclü brend imicini yaratdıqdan sonra öz reklamlarını daha sonra Facebook və Twitter kimi elektron platformlarda yaymağa başladı. Xüsusilə bu kampaniyada həmin məhsullardan istifadə edən istehlakçıların təcrübələrinin də nəzərə alınması və digər istehlakçılara çatdırılmsası həmin kampaniyanın daha da uğurlu olmasına səbəb oldur (Vaynerchuk G, 2019, 259 s). Aşağıdaki cədvəl 1-də ümumi olaraq 2021-ci il üzrə danışıq marketinqindən istifadə edən istehlakçıların istifadə səviyyəsi göstərilmişdir:

**Cədvəl 1.** 2021-ci il üzrə Qlobal Reklama Güvən Hesabatı

| Danışıq marketinqdən yararlanan istehlakçılar | İstehlakçıların yararlanma göstəriciləri (faizlə) |
|---|---|
| Dost və tanışlarının məsləhətlərinə etibar edən istehlakçılar | 83% |
| Digər istehlakçıların məsləhətlərinə etibar edən istehlakçılar | 78% |
| Rəqəmsal mühitdə digər istehlakçıların məsləhətlərinə etibar edən istehlakçılar | 61% |
| Mal vəya xidmətdən yararlanma ilə bağlı təcrübələrini digər istehlakçılara təqdim edən istehlakçılar | 57% |
| Mal və ya xidmətdən narazı qalaraq öz təcrübələrini digər istehlakçılarla bölüşən istehlakçıların | 90% |

**Mənbə**: GlobalDigitalReport (2021)., https://www.digitalreport.weaewsocial.com/

Yuxarıdaki cədvəl 1-dəNielsen tədqiqat şirkətinin dünyanın 60 ölkəsində onlayn istifadəçilərlə apardığı sorğu nəticəsində hazırladığı “Qlobal Reklama Güvən Hesabatıdır”. Həmin hesabata əsasən istehlakçıların 83%-i dost və tanışlarının məsləhətlərinə etibar etdiklərini irəli sürmüşdür. Bundan 26 min fərdi şəxslərlə aparılan sorğunun nəticələrinə görə, iştirakçıların 78%-i istehlakçı tövsiyələrinəinanmış, qəzetlərə 63%-i və internet istifadəçilərinin məsləhətlərinə isə 61%- i inandığı məlum olmuşdur. Məhz bu nəticələrə əsasən rəqəmsal marketinq mühitində danışıq marketinqi alətinin aktuallığının artdığının bir daha şahidi olururq. Bu aktuallığın artış

göstərməsinin əsas səbəbi danışıq marketinq alətinin rəqəmsal marketinq mühitinə verdiyi faydalardır. Danışıq marketinqinin rəqəmsal marketinqdə verdiyi əsas faydalardan biri bu marketinq alətindən istifadə zamanı aşağı qiymətin tələb olunmasıdır. Burada danışıq kampaniyalarında "istifadəçilər bizim üçün vacibdir" devizi əsasında, onlar bir növ marka elçisi məzmunun yayılması mövqeyində çıxış edirlər. İnternet platformasında danışıq marketinqi mühitində formlaşan bir video, heç bir depozit və ya daha çox göstərmədən böyük beynəlxalq auditoriyanı əldə edə bilmək qabiliyyətinə malik olmasıdır. Bu baxımdan danışıq marketinqi aləti rəqəmsal marketinqə yüksək səviyyədə müştərini əldə edə bilmə potensiyalını təqdim edir (Fraile, A. 2019; Whatisviralmarketingadvantages and examples., https://www.cyberclick.es,).

Video marketinq, məhsul və ya xidmətlərin təşviqi marketinqi, rəqəmsal və sosial kanallar vasitəsi ilə müştəriləri maarifləndirərək hədəf auditoriyanı əldə etmək üçün videolardan istifadə edilməsi kimi müəyyən edilə bilər. Burada istifadə edilən video marketinq aləti əyləncəli, vizual və istehlakçıları həvəsləndirici bir vasitə olduğunu ifadə edir. Onlayn video marketinq, rəqəmsal marketinq kontekstində bir markanı, məhsulu və ya xidməti tanıtmaq üçün bütün video məzmundan istifadəolunmasıdır (Boman, K. ve Raijonkari K 2017; 80 p). Başqa sözlə, video marketinq marketinq üsulları, alətlərininproseduru olaraq başa düşülür. Video marketinq alətinə olan marağın artmasında mühüm rol oynayan əsas faktor effektiv video marketinq strategiyasıdır. Effektiv video marketinq strategiyası hazırlamaq üçün videolar üçün müntəzəm yayım cədvəli yaratmaq ya unikal, cəlbedici və əyləncəli məzmunlu videolar formlaşadırmaq, video təqdimatında göz oxşayan başlanğıc əlavə etmək, potensial hədəf auditoriya və ya müştərilərlə əlaqə qurmağı hədəfləmək, və video müddətini təyin etmək kimi ünsürlərlə ümumiləşdirməkmümkündür (Hüseynli B 2021; 43 s). Məhz bu strategiyanı izləyən şirkətlərin sayının artması paralel olaraq onlayn videolar və onlara əlavə olunan reklamların sayının gün keçdikcə sürətlə artışına səbəb olur. Video məzmunu həm böyük, həm də seçilmiş insan qruplarına əhəmiyyətli səviyyədə təsir etmək qabiliyyətinə malik olduğu üçün provayderlər getdikcə daha çox seçdikləri vasitə kimi vizual formatlardan istifadə edirlər. Aşağıdaki şəkil 4-də 2021-ci il üzrə marketoloqların yerləşdirdiyi videoların ən çox yer aldığı elektron platformalar göstərilmişdir:

Şəkil 2-dən də gördüyümüz kimi şirkətlər tərəfindən ən çox video marketinq vasitəsindən istifadə edilən elektron platforma 87 faizlə YouTube-dur. Belə ki, 2021-ci ildə təxminən 1,68 milyard istifadəçisi olan YouTube, qlobal istifadəçi üçün 563,6 milyon dollar xərclənmiş, burada ay ərzində əldə edilən gəlir məbləği15,15 milyard dollar və aylıq daxil olan istifadəçilərin sayı isə 2 milyard olmuşdur. 2021-ci ilin may ayında isəYouTube-da dəqiqədə 500 saatdançox videolar yüklənmiş və bu internet istifadəçiləri arasında video məzmun üçün artan tələbi əks etdirmişdir.Bu isə əvvəlki illərlə müqayisədə iki dəfə artış deməkdir (Clement, J. 2021; YouTube-Statistics&Facts, https://www.statista.com/ topics/2021/youtube/). Daha sonra bu ardıcıllığı 83 faizlə Linkedin, 79 faizlə Facebook elektron platforması izləmişdir. Bundan əlavə 2021-ci il üzrə hər istifadəçiyə görə saytda hesablanmış gündəlik vaxt, Google. com saytına 15.41 dəqiqə; Youtube.com 16: 53 dəqiqə; Facebook.com 17.52 dəqiqə; Amazon.com: 10,24 dəqiqə və Instagram.com: 8,48 dəqiqə olaraq hesablanmışdır (https://www.alexa.com/topsites, 2021; the top 500 sites on theweb).

**Şəkil 2.** 2021-ci il üzrə marketoloqlar tərəfindən ən çox istifadə edilən elektron platformalar




**Mənbə:**https://www.hubspot.com/marketing/state-of-video-marketing-new-data

Video marketinqin rəqəmsal marketinqdəki ən əsas üstünlüklərindən biri məlumatlılığı artırmaq, hədəf auditoriyanın və ictimaiyyətin diqqətini cəlb edərək müsbət münasibətlərin inkişaf etdirilməsini qeyd etmək mümkündür. Bundan əlavə videolar istehlakçılara bir çox kanalda sürətli və asan şəkildə istehlak oluna bilən məzmun təqdim edirlər. B2C və B2B məzmun marketinqi perspektivləri baxımından, müştərilərin suallarına cavab vermək, məlumat vermək, onlarla əlaqə yaratmaqda təsirli olur və bu videoları rəqəmsal marketinq strategiyasının formalaşması üçün vacib alətə çevirir. Şirkətlər əvvəllər video yaratmaq xərcləri ilə mübarizə aparırdılarsa, indi videolar əvvəlkindən daha əlçatan mövqeyə sahibdir. Beləliklə videolardan istifadə edən müəssisələr rəqiblərini çox geridə qoya bilər. Rəqəmsal marketinq platformalarında həmkarlarından daha çox videodan istifadə edən şirkətlərdə daha çox əhatə dairəsi, istehlakçılar arasında daha çox xatırlanma və müştəri xidməti xərclərinin daha aşağı olduğu aşkar edilmişdir. Bundan əlavə, videolar müştərilərə sual vermədən izahat verməyə imkan verməsi müvafiq müştəri xidməti və ya inzibati heyətin azaldaraq şirkətlərin xalis gəlirini artıra bilər (Bhardwaj J., Sharma A 2020; p 90-96). Video marketinqin üstün xüsusiyyətlərinin olmasına baxmayaraq çatışmayan xüsusiyyətləri də mövcuddur. Video marketinqin əsas çatışmayan xüsusiyyətləri strategiyanın olmaması, qeyri-kafi büdcə, effektiv məzmunun olmaması və hesablama meyarlarının olmamasıdır. Bundan əlavə video marketinq dünyasıgündən-günə daha da rəqabətli bir xüsusiyyətə malik olur. Hal-hazırda marketinq platforması təkcə markalar üçün deyil, həm də kiçik və orta şirkətlər üçün də açıqdır. Bir saniyədə internetə yüklənmiş yüz minlərlə video məzmunu ilə insanların və markaların həmin kütlənin içində itməməsi getdikcə çətinləşir. Davamlı olaraq inkişaf edən video marketinq mühiti və dəyişən sosial media platformaları trendləridə eyni sürətlə dəyişir. Həmçinin sosial media trendlərindəyişməsindən asılı olaraq müştəri davranışının dəyişməsi, həmin müştəriləri əldə saxlamaq üçün daha çox cəlbedici video məzmununun təqdimatını da çətinləşdirir.

Rəqəmsal marketinq mühitində şirkətlərin geniş şəkildə istifadə etdiyi marketinq vasitələrindən biri elektorn poçt marketinqdir. Elektronpoçt marketinqi mal və ya xidmətlər haqqında elektron poçt vasitəsi ilə məlumatın müştəriyə göndərildiyi marketinq formasıdır. Elektron poçt marketinqi rəqəmsal marketinqin ən klassik və sadə növlərindən biridir. Buna baxmayaraq hal-hazırda da marketoloqlar mövcud müştərilərlə əlaqələrini inkişaf etdirmək üçün elektron poçtlardan geniş şəkildə istifadə edirlər. Marketoloqların elektron poçtlardan geniş şəkildə istifadə etməsinin başqa bir səbəbi isə burada aparılan xərcləmələrin digər marketinq fəaliyyətlərindən xeyli aşağı olmasıdır. Elektron poçt marketinqində şirkət tərəfindən hazırlanan mesajın heç bir vasitəçidən istifadə olmunmadan rahat bir şəkildə öz müştərisinə göndərilməsi imkanı vardır. Bununla belə, rəqəmsal marketinqdə elektron poçtdan istifadə olunarakən düzgün məzmunun doğru zamanda göndərilməsinə xüsusi diqqət yetirilməlidir. Bundan əlavə, bu yerləşdirmə müəyyən vaxt intervalları ilə həyata keçirilməli, qısacası müştəri elektron poçtlarla bezdirilməməlidir Bu gün elektronika poçt marketinqinisadələşdirən ən yaxşı brendlər "MailChimp" adlı daimi əlaqədir. "MailChimp" də elektron poçtun hazırlanması prosesi avtomatlaşdırılır. Bu, tez sinxronizasiya etməyə və göndərməyə imkan verən bir vasitədir. Bundan əlavə, həmin sistemdə peşəkar şablonlar mövcuddur. Beləliklə, düzgün elektorn poçt lazımi vaxtda lazımi şəxsə göndərilə bilir. Elektron poçt marketinq proqramı marketoloqlara elektron poçt vasitəsilə marketinq kampaniyası başlatmağa kömək edən populyar proqramlarından bəziləri MailChimp, Getresponse, Sendy və Infusionsoft-dur. GoogleAnalytics kimi bir çox xidmətlər veb-səhifədə ziyarətçilərin fəaliyyətini izləməyə imkan verməklə birlikdə, həmin fəaliyyət məlumatlarını abunəçilərin elektron poçtları ilə əlaqələndirərək potensial marketinq imkanları haqqında məlumat almaq da mümkün olur.Şirkətlər elektron poçt marketinqinin əldə etdiyi uğur səviyyəsini müəyyənləşdirmək və izləmək üçün klikləmə sayını, çatdırılma səviyyəsini, maillərin açılması dərəcəsi kimi müxtəlif hesab meyarlarından istifadə edirlər.Aşağıdaki şəkil 5-də ConstantContact-ın 2021-ci ilin aprel ayında 200 milyondan çox müştərinin elektron poçtunu sektordan-sektora nəzərdən keçirməsində bütün sektorlar üzrə ümumi orta göstərici qeyd edilmişdir:

**Şəkil 3.** Mesaj Növü üzrə elektron poçt hesablama meyarlarının müqayisəsi (2021)




**Mənbə:** https://www.knowledgebase.constantcontact.com/Eri%C5%920.12.2021

Şəkil 3-dən də gördüyümüz kimi elektron poçtun açılma faizi16,22% olmuşdur. Elektron poçtun açılma nisbəti insanların göndərilən elektron poçtu neçə dəfə açdığını göstərir. Elektron poçtun açılma nisbəti aşağıdaki düsturla tapılır:

$$Elektron\ poçtun\ açılma\ nisbəti = \frac{Açılan\ elektron\ poçtlar}{Qəbul\ edilən\ elektron\ poçtlar}$$

Şəkildə göstərilən ikinci hesablama meyarı isə 7,17 faizlə kliklənmə nisbətidir.Kliklənmə nisbəti elektron poçtdakı linklərə neçə dəfə klikləndiyini göstərir. E-poçt
kliklərinin nisbəti aşağıdaki düsturla hesablanılır (Gedik Y., 2020; 15s):

$$Kliklənmə\ nisbəti = \frac{Elektron\ poçt\ kliklərinin\ sayı}{Göndərilən\ elektron\ poçtların\ sayı}$$

Şəkil 3-də göstərilən növbəti hesablama meyarı isə 7,75 faizlə dərhal çıxış nisbətidir.Dərhal çıxış nisbəti elektron poçtlar alıcıya çatmadıqda və ya göndərənə həmin poçt geri qaytarıldıqda baş verir. Bu nisbət aşağıdaki düsturla hesablanılır:

$$Dərhal\ çıxış\ nisbəti = \frac{Dərhal\ çıxış\ sayı}{Göndərmə\ cəhdlərinin\ sayı}$$

Bu hesablama əsasında iki cür nəticə əldə etmək mümkündür. Birincisi elektron poçtalıcının ünvanı etibarsız və ya mövcud olmadığı səbəbindən həmişəlik rədd edildikdə bu çıxış sərt çıxış hesab edilir. İkincisi isə elektron poçt alıcıya çatdıqda, lakin geri qayıtdıqda isə burada yumşaq çıxış olur, yəni belə olan halda gələcəkdə elektron poçtların hələ də uğurla çatdırılma şansı mövcuddur. Həmin şəkildə göstərilən dördüncü hesablama meyarı isə 0,01 %-ləabunəlikdən çıxma nisbətidir.Bu nisbət istifadəçilərin göndərilən elektron poçtları bəyənməmə ehtimalını göstərir və aşağıdaki düsturla hesablanılır (Gedik Y 2020; 15s):

$$Abunəlikdən\ çıxma\ nisbəti = \frac{Abunəlik + Spam\ şikayətləri}{Açılan\ elektron\ poçtların\ cəmi}$$

Elektron poçt marketinqinin rəqəmsal marketinqdəki üstünlüklərinin əsas səbəblərindən birincisi, elektron poçtun birbaşa poçtla müqayisədə daha ucuz olmasıdır. İkincisi, elektron poçt reklamı istehlakçılardan daha sürətli şəkildə cavab ala bilirlər. Elektron poçt marketinqi ilə təqdim edilən reklam qlobal hədəf bazarlarına sürətlə yayılma imkanına malikdir. Üçüncüsü, elektron poçt məzmuna keçidlər əlavə etməklə istehlakçılarla qarşılıqlı əlaqəni təşviq etməsi baxımından üstün xüsusiyyətlərə malikdir. Elektron poçt məzmun, paylama və ölçü baxımından marketinq kampaniyaları üçün yeni imkanlar yaradır. İcazəyə əsaslanan və diqqəti cəlb edən məzmun uğurlu kampaniyalara səbəb olur. Bundan əlavə, elektron poçt marketinqi elektron poçt mesajının açılma dərəcəsi, keçid klikləri və satınalma qərarları (çevirmə dərəcəsi) daxil olmaqla, kampaniyanın effektivliyinin daha yaxşı ölçülməsini təmin edir. Elektron poçt markaya sadiqliyin artırılmasında mühüm vasitədir, çünki o, şirkətlərə müştəriləri ilə müntəzəm olaraq aşağı qiymətə ünsiyyət qurmağa köməklikk edir. Elektron poçt məqsədyönlü və fərdiləşdirilmiş ünsiyyət üçün böyük potensial təklif etməklə birlikdə kağızdan istifadə edilmədiyi üçün ekoloji cəhətdən son dərəcə təmizdir. Məhz bu üstün xüsusiyyətlərdən dolayı elektron poçt istifadəçilərinin sayı gün keçdikcə artışgöstərməkdədir. Belə ki, 2018-ci ildə dünya üzrə hər gün təxminən 281 milyard elektron poçt göndərilmiş və qəbul edilmişdir. 2019-cu ildə isə qlobal elektron poçt istifadəçilərinin sayı 3,9 milyard olmuşdur. Həmin göstəricilərin 2023-cü ildə 347 milyardı keçəcəyi, 2024-cü ilə qədər isə 4,48 milyarda yüksələcəyi gözlənilməkdədir. 2018-ci ilin dekabr ayında elektron poçt açılışlarının 43%-i mobil cihazlardan həyata keçirilmişdir. Bunlar içərisində ən populyarı “AppleIphone” 29%-lə və “GoogleGmail” 27% göstərici ilə elektron poçt müştəriləri arasında ilk iki yeri təşkil

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023

edir. Buna baxmayaraq 2019-cu ilin fevral ayında aparılan qlobal araşdırmaya görə istifadəçilərin 45%-i naməlum elektron poçt ünvanlarından gələn elektron poçtları açmaqdan çəkindiklərinibildirmişdirlər. Müştəri razılığına əsaslanan elektron poçtlar rəqəmsal marketinq mühitində gün keçdikcə artış göstərir. Elektron poçt marketinqi xüsusilə müştərilərlə daha sıx əlaqələr qurmaq və brend imicini yaxşılaşdırmaq istəyən şirkətlər üçün mühüm marketinq kommunikasiya vasitəsidir. Təbliğat mesajlarının yayılması vasitəsi kimi elektron poçtun geniş şəkildə mənimsənilməsi aşağı qiymətlərlə quraşdırma, paylama xərcləri, endirimlər, kuponlar kimi kampaniyaların məqsədyönlü şəkildə paylanması kiçik və orta biznes üçün əlverişli xüsusiyyətlər kimi üstünlüklərə malikdir (https://www.statista.com/statistics/255080/number-of-e-mail-users-worldwide/). Elektron poçt marketinqinin üstün cəhətləri ilə birlikdə çatışmayan xüsusiyyətləri də mövcuddur. Bu çatışmayan xüsusiyyətlərdən bəziləri, mürəkkəb elektron poçt filtrləri səbəbindən elektron poçtun çatdırılmaması riski, müştərilərin gələn qutularındakı sıxlıq səbəbindən bəzi elektron poçtları açmama riski, abunəlikdən çıxma riskidir. Yəni burada abunəçiləri uzun müddət eyni bizneslə maraqlandırmaq o qədər asan deyildir. Bundan əlavə bəzi brauzerlərin reklam məzmununu göstərə bilməməsi səbəbindən alıcıların dərhal pəncərəni bağlamaq riski də elektron poçt marketiqinin çatışmayan xüsusiyyəti hesab oluna bilər. İlk baxışdan elektron poçt marketinqi çox ucuz olsa da, müştərilərə mükəmməl elektron bülletenlər çatdırmaq üçün texnoloji resurslar tələb olunur. Elektron poçt marketinqinin digər çatışmazlıqları isə elektron poçt əlavələri və spam vasitəsilə virusların asan yayılmasıdır. Qeyd edilən bu məsələ olduqca vacibdir, çünki bir çox internet xidməti təminatçıları hansı mesajların spam, hansının qanuni olduğunu müəyyən etmək üçün spamfiltrlərindən istifadə edirlər. Spam hesab olunan elektron poçtlar heç vaxt nəzərdə tutulan alıcılara çatmayacaqdır. Buna görə də diqqətli olmaq lazımdır ki, bütün marketinq elektron poçtları yalnız biznes məhsulları və ya xidmətləri haqqında xüsusi olaraq məlumat tələb edən elektron poçt alıcılarına keyfiyyətli məzmun təqdim edilməlidir (Todor R.D., 2017; ss.61-66). Günümüzdə rəqəmsal marketinqə olan tələbatın artmasının səbəblərindən biri məhz rəqəmsal marketinq alətlərindən uğurlu şəkildəistifadə edilməsidir. Xüsusilə son dövrlərdə sosyalmedya marketinqi, məzmun marketinqi, video və danışıq marketinqlərinə olan tələbatın artması qeyd etdiklərimizi bir daha əyani olaraq sübut etmiş olur. Burada əsas məsələ yuxarıda marketinq alətləri ilə bağlı qeyd edilən çatışmazlıqların aradan qaldırılması və şirkətlərin ideal bir mühitdə müştərilərə yüksək səviyyəlirəqəmsal marketinq xidməti göstərməsidir.

**Nəticə**

Ümilikdə aparılmış təhlilin nəticələrini aşağıdakı kimi ümumiləşdirmək olar:

-Video marketinqin əsas çatışmayan xüsusiyyətləri strategiyanın olmaması, qeyri-kafi büdcə, effektiv məzmunun olmaması və hesablama meyarlarının olmaması səbəbindən effektiv məzmun düşünülməli, artıq video marketinq alətinin istifadə zamanı şirkətlərin əldə etdiklər uğurları müəyyənləşdiməsində hesablama meyarları təyin edilməlidir. Hal-hazırda marketinq platforması təkcə markalar üçün deyil, həm də kiçik və orta şirkətlər üçün də açıqdır. Bir saniyədə internetə yüklənmiş yüz minlərlə video məzmunu ilə insanların və markaların həmin kütlənin içində itməməsi getdikcə çətinləşir. Həmçinin sosial media trendlərin dəyişməsindən asılı olaraq müştəri davranışının dəyişməsi, həmin müştəriləri əldə saxlamaq üçün daha çox cəlbedici video məzmununun təqdimatını da çətinləşdirir. Buna görədə şirkətlər fəaliyyət göstərdikləri zaman sosial medya trendlərində baş verən dəyişikliklərə xüsusi diqqət yetirməli, müştəriləri daima əlində saxlamağı bacarmalıdır.

- Məzmun marketinqin çatışmayan xüsusiyyətlərinə gəldikdə isə maraqlı məzmunun istehsalı, məzmunun effektivliyini məzmunun davamlılığını, investisiyanın qaytarılmasını hesablayan meyarların hələ də mövcud olmaması, büdcə çatışmazlığı kimi problemlər hələ də qarşımıza çıxmaqdadır. Burada oxşar problem video marketinqdə olduğu kimi məzmun markentinqində də investisiyaların qaytarılmasının müəyyənləşdirə biləcək hesablama meyarlarının mövcud olmamasıdır. Qeyd edilən çatışmazlıqlar ortadan qaldırılarsa uğurlu bir şəkildə məzmun marketinqi alətindən dolayısı ilə uğurlu rəqəmsal marketinq strategiyasının həyata keçirilməsi mümkün olacaqdır.

-Bu çatışmayan xüsusiyyətlərdən bir başqası isə mürəkkəb elektron poçt filtrləri səbəbindən elektron poçtun çatdırılmaması riski, müştərilərin gələn qutularındakı sıxlıq səbəbindən bəzi elektron poçtları açmama riski, abunəlikdən çıxma riskidir. Yəni burada abunəçiləri uzun müddət eyni bizneslə maraqlandırmaq o qədər asan deyildir. Bundan əlavə bəzi brauzerlərin reklam məzmununu göstərə bilməməsi səbəbindən alıcıların dərhal pəncərəni bağlamaq riski də elektron poçt marketiqinin çatışmayan xüsusiyyəti hesab oluna bilər. İlk baxışdan elektron poçt marketinqi çox ucuz olsa da, müştərilərə mükəmməl elektron bülletenlər çatdırmaq üçün texnoloji resurslar tələb olunur. Elektron poçt marketinqinin digər çatışmazlıqları isə elektron poçt əlavələri və spam vasitəsilə virusların asan yayılmasıdır. Qeyd edilən bu məsələ olduqca vacibdir, çünki bir çox internet xidməti təminatçıları hansı mesajların spam, hansının qanuni olduğunu müəyyən etmək üçün spam filtrlərindən istifadə edirlər. Spam hesab olunan elektron poçtlar heç vaxt nəzərdə tutulan alıcılara çatmayacaqdır. Buna görə də diqqətli olmaq lazımdır ki, bütün marketinq elektron poçtları yalnız biznes məhsulları və ya xidmətləri haqqında xüsusi olaraq məlumat tələb edən elektron poçt alıcılarına keyfiyyətli məzmun təqdim edilməlidir.

## ƏDƏBIYYAT

1. Poradova, M. “Content Marketing Strategy and Its Impact on Customers Under The Global Market Conditions”./ SHS Web of Conferences.- 2020, 74, 01027, EDP Sciences., p 1-8
2. Efendioğlu İ. H. “TheImpact of Conspicuous Consumptionin Social Media on Purchasing Intentions”./ İşletme Araştırmaları Dergisi.-2019, p 76-90.
3. Baltes, L.P. “Content marketing - The fundamental tool of digital marketing”.//Bulletin of the Transilvania University of Braşov Series V: Economic Sciences.-2019, p. 111-118.
4. https://www.az.unitinal.com/m%C9%99zmun-marketinqi-n%C9%99dir
5. Wang W.L., Malthouse E., Calder B., Uzunoğlu E (). “B2B Content Marketing for Professional Services: In-Person Versus Digital Contact”.// Industrial Marketing Management.- 2019, p 160-168.
6. https://marketinginsidergroup.com/content-marketing/metrics-to-measure-content-performance
7. https://www.contentmarketinginstitute.com//most-important-factors-in-content-marketing
8. Thompkins Y.L “Seeding Viral Content The Role of Message and Network Factors”. Journal of Advertising Research.-2018, 52(4), 465-478
9. Vaynerchuk, G. “Teşekkür Ekonomisi: Müşteri Bağlılığı Yaratmak İçin Sosyal Medyayı Nasıl Kullanmalısınız”.- İstanbul: Media Cat Kitapları, 2019, 259 s.
10. Global Digital Report . https://www.digitalreport.weaewsocial.com/.-2021)

11. Fraile, A. What isviral marketing advantages and examples., https://www.cyberclick.es,-2019
12. Boman K., Raijonkari K. "Online Video as a Marketing Tool: A Quantitative Survey on Video Marketing Habits"./Jamk University of Applied Science, Bachelor's Thesis..-2017, 80 p
13. Hüseynli B. "Rəqəmsal marketinq strategiyaları".-Azərbaycan Dövlət İqtisad Universiteti., 2021, 43 s.
14. https://www.hubspot.com/marketing/state-of-video-marketing-new-data
15. Clement, J. YouTube- Statistics&Facts, https://www.statista.com/
16. topics/2021/youtube/
17. https://www.alexa.com/topsites, 2021; the top-500 sites- on theweb
18. Bhardwaj J.,Sharma A. " How Video Marketing Commerce Can Boost Sales".//IME Journal.-2020, 14(1), p 90-96.
19. https://www.knowledgebase.constantcontact.com/Eri%C5%920.12.2021
20. Gedik Y. "E-Posta Pazarlama: Teorik Bir Bakış"., Uluslararası Yönetim Akademisi Dergisi..- 2020, 15 s.
21. https://www.statista.com/statistics/255080/number-of-e-mail-users-worldwide/
22. Todor R.D. "Promotion and Communication Through E-mail Marketing Campaigns".//Bulletin of the Transilvania University of Braşov Series V: Economic Sciences.- 2017, S.10(59)-1, s.61-66.

# ФУНКЦИЯ ВИДОВ МАРКЕТИНГА В ЦИФРОВОМ МАРКЕТИНГЕ

**Офелия Софиева[1], Айла Исмаилзаде[2]**
[1,2] Азербайджанский государственный экономический университет, [1,2] кафедра Экономики и технологических наук,
[1]кандидат экономических наук
[2]магистрант, Email: aylaismayilzada@gmail.com

## РЕЗЮМЕ

В статье изучены роль и значение концепций контент-маркетинга, диалогового маркетинга, видеомаркетинга и электронного маркетинга в цифровом маркетинге. Здесь контент-маркетинг может помочь с поисковой оптимизацией, завоевать доверие и ценность, наладить отношения с клиентами, уменьшить зависимость от внешних ресурсов, получить больший контроль над обменом сообщениями компании, выделиться как эксперт в предметной области, планировать, создавать, распространять и измерять контент. у были отмечены положительные достижения в цифровом маркетинге, такие как добавление гибкости к стратегии. Далее, диалоговый маркетинг имеет такие черты, как опора на мнения разных потребителей при исследовании услуги или товара, а его основная цель – донести до других потребителей удовлетворенность клиентов, довольных их товаром. среда цифрового маркетинга. Разговорный маркетинг имеет особенность распространяться быстрее, чем другие методы маркетинга, как с точки зрения использования интернет-

ресурсов, так и с точки зрения возможности установления контактов с людьми посредством электронного общения. Именно из-за этих характеристик разговорный маркетинг достиг предела, став основной маркетинговой стратегией многих предприятий. Одним из основных преимуществ видеомаркетинга в цифровом маркетинге является то, что с его помощью можно повышать осведомленность, привлекать внимание целевой аудитории и общественности, развивать позитивные отношения.
**Ключевые слова:** цифровой маркетинг, контент-маркетинг, диалоговый маркетинг, видеомаркетинг, электронный маркетинг.

Publication history

Article received: 08.02.2023
Article accepted: 22.02.2023
Article published online: 14.03.2023
DOI suffix: 10.36962/PAHTEI26032023-112

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

E-ISSN: 2674-5224

VOLUME 26 ISSUE 03 2023 126-136

# MANAGEMENT OF SUSTAINABLE DEVELOPMENT OF AGRICULTURE IN THE REPUBLIC OF AZERBAIJAN

**Zulfugar Ibrahimli[1], Aykhan Huseynzade [2]**

[1,2] Azerbaijan State University of Economics, [1,2] Department of International economy and business
[1] Docent, Candidate of economic sciences
[2] Master student, Email: ayxan00033@gmail.com

## ABSTRACT

It is extremely important to study the place of Azerbaijan's national economy in the world economic system and the potential opportunities of each sector, to determine the level of development and its place in the international world. The Republic of Azerbaijan belongs to the category of small states in terms of the number of its inhabitants and the land area they own. However, the level of development and achievements of the national economy in certain areas are noteworthy. In the last decade of the 20th century, the economy of Azerbaijan faced serious losses and economic and political upheavals, but it has reached the position of a sustainable and economically independent country in the 21st century.

The agricultural development of each state depends on the lands of the country having favorable conditions for agriculture, and the agricultural policy applied in the country determines that development. Agricultural policies are considered a part of the general economic policy implemented by the country. The characteristics of the agricultural sector affecting the development of agriculture and the implemented economic development policies influence each other. Since the characteristics of the agricultural sector, its structure, the condition, use and purposes of agricultural land are different in each country, the countries determine the appropriate policies for the development of the sector according to these characteristics. Agriculture also affects changes in production due to the positive or negative results of agricultural policies. Structural and geographical features of regions are another factor affecting agricultural production. Agricultural policies determined by countries are often organized on a regional basis, taking into account these characteristics. In the determination and implementation of the agricultural policy in Azerbaijan, the above factors are taken into account and applied in the territory of the country

The article is devoted to the analysis of the current situation of the agriculture of the Republic of Azerbaijan. The management factors and problems of sustainable development of agriculture in the Republic of Azerbaijan are analyzed here. The agricultural development of each state depends on the lands of the country having favorable conditions for agriculture, and the agricultural policy applied in the country determines that development. Agricultural policies are considered part of the overall economic policy implemented by the country. The characteristics of the agricultural sector affecting the development of agriculture and the implemented economic development policies influence each other. Since the characteristics of the agricultural sector, its structure, the condition, use and purposes of agricultural land are different in each country, the countries determine the appropriate policies for the development of the sector according to these characteristics. The cooperation of the government of the Republic of Azerbaijan with international economic and financial institutions in the agricultural sector, as well as in other fields, has played an important role in the development of this field. In this regard, the

international organizations with which the Republic of Azerbaijan cooperates as a factor in the management of sustainable development in the agricultural field are mentioned in the article, and the innovations brought by these organizations to the agricultural sector of our country are analyzed.
Agriculture is considered the most important sector of Azerbaijan's economy after the oil sector. 36% of the working age population of Azerbaijan has employment in this sector. In addition, after the oil sector, the agricultural sector is the second most important sector in exports.
**Keywords:** agriculture, agrarian sector, international organizations, economic relations, irrigation system

# AZƏRBAYCAN RESPUBLİKASINDA KƏND TƏSƏRRÜFATININ DAVAMLI İNKİŞAFININ İDARƏ EDİLMƏSİ

[1]**Zülfüqar İbrahimli[1], Ayxan Hüseynzadə**[2]
[1,2] Azərbaycan Dövlət İqtisad Universiteti, [1,2] Beynəlxalq iqtisadiyyat və biznes” kafedrası
[1]dosent, iqtisad üzrə fəlsəfə doktoru,
[2] magistr tələbəsi, Email: ayxan00033@gmail.com

## XÜLASƏ

Məqalə Azərbaycan Respublikasının kənd təsərrüfatının mövcud vəziyyətin təhlilinə həsr olunmuşdur. Burada Azərbaycan Respublikasında kənd təsərrüfatının davamlı inkişafının idarə edilməsi amilləri və problemləri təhlil edilmişdir. Hər bir dövlətin kənd təsərrüfatının inkişafı ölkənin kənd təsərrüfatı üçün əlverişli şəraitə malik olan torpaqlarından asılı olmaqla birlikdə ölkədə tətbiq olunan kənd təsərrüfatı siyasəti həmin inkişafı müəyyən edir. Kənd təsərrüfatı siyasətləri ölkənin həyata keçirdiyi ümumi iqtisadi siyasətin bir hissəsi hesab edilir. Kənd təsərrüfatının inkişafına təsir edən aqrar sektorun xüsusiyyətləri və həyata keçirilən iqtisadi inkişaf siyasətləri bir-birinə təsir göstərir. Hər bir ölkədə kənd təsərrüfatı sektorun xüsusiyyətləri, onun strukturu, kənd təsərrüfatı torpaqlarının vəziyyəti, istifadəsi və məqsədləri fərqli olduğu üçün ölkələr bu xüsusiyyətlərə görə sektorun inkişafı istiqamətinə uyğun siyasətləri müəyyən edir. Azərbaycan Respublikası hökuməti digər sahələrdə olduğu kimi kənd təsərrüfatı sektoru ilə də beynəlxalq iqtisadi və maliyyə qurumları ilə əməkdaşlıq etməsi bu sahənin inkişafında mühüm rolu olmuşdur. Bu baxımdan məqalədə Azərbaycan Respublikasının aqrar sahədə davamlı inkişafının idarə edilməsi amili olaraq əməkdaşlıq etdiyi beynəlxalq təşkilatlar qeyd edilmiş və bu təşkilatların ölkəmizin kənd təsərrüfatı sektoruna gətirdiyi yeniliklər analiz edilmişdir.
**Açar sözlər:** kənd təsərrüfatı, aqrar sektor, beynəlxalq təşkilatlar, iqtisadi əlaqələr, suvarma sistemi

## Giriş

Müasir iqtisadi mühitdə qloballaşma prosesinin güclənməsindən irəli gələn iqtisadi problemlərdən dolayı hər bir ölkənin özünün iqtisadi cəhətdən təhlükəsiz olması, mövcud istehsalatda öz maraqlarının reallaşdırılması, funksional yerini qoruyub saxlaması məsələlərini gündəmə gətirmişdir. Bu gün Azərbaycan üçün ən mühüm məqsədlərdən biri iqtisadiyyatın neftdən

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023

asılılığını aradan qaldırmaq və iqtisadi inkişafın daha çox kəndlərə yayılmasını təmin etməkdir. Azərbaycan iqtisadiyyatında kənd təsərrüfatı neft və tikintidən sonra üçüncü böyük sahədir, iş yerləri və girov ən böyük paya malikdir. Eyni zamanda, kənd yerlərində olduğu kimi, bu sahədə də yoxsulluğun azaldılmasına əhəmiyyətli dərəcədə təsir edən sahədir. 1995-ci ildə uğurla həyata keçirilən kənd təsərrüfatı islahatları nəticəsində ölkə iqtisadiyyatında bazar münasibətlərinin bərqərar olmasına, torpaq və əmlakdan səmərəli istifadəyə, kənd təsərrüfatı vahidi ərazi strukturunun inkişafına, sahibkarlıq mühitinin genişlənməsinə ciddi təsir göstərmişdir. Nəticədə aqrar strukturun sosial quruluşunda əsaslı dəyişikliklər baş vermişdir. İri kənd təsərrüfatı formalarının yerində müvafiq sayda fermer təsərrüfatları yaradılmış, geniş fərdiləşdirməsiyasətinə uyğun olaraq əkin sahələri, mal-qara, istehsal və qeyri-istehsal obyektlərində dövlət mülkiyyəti, kənd təsərrüfatı texnikası fərdi təsərrüfatlarla əvəz edilmişdir.

**Məqsəd**

Tədqiqat mövzusunun məqsədi kənd təsərrüfatının mövcud vəziyyətinin araşdırılmasıdır. Azərbaycan Respublikasında kənd təsərrüfatının davamlı inkişafının idarə edilməsi amilləri və problemləri haqqında ətraflı tədqiqat aparmaq, kənd təsərrüfatı siyasətinin ümumi iqtisadi siyasətin bir hissəsi olaraq təhlilə cəlb etmək bu məqsəddən irəli gələn qarşımıza qoyduğumuz vəzifələrdir.

**Problemin aktualliği və əlaqəli tədqiqatlar**

Müasir iqtisadiyyatın inkişaf etdiyi bir dövrdə kənd təsərrüfatı sahəsinin vacibliyi gün keçdikcə daha da artmaqdadır. Çünki neft sektoru ilə yanaşı bu sahənin inkişafı regionların inkişaf səviyyəsinə müsbət təsir göstərir. Regionların davamlı sosial-iqtisadi inkişafının təmin edilməsi dövlətin həyata keçirdiyi milli iqtisadi siyasətin tərkib hissəsi kimi kənd təsərrüfatının üzərinə düşür.

**Metodlar**

Məqalənin yazılması zamanı bir neçə metodlardan istifadə olunmuşdur ki, bunlardan qrafik, statistik, təsnifat, analiz, sintez metodlarını qeyd edə bilərik. Təhlildə empirik tədqiqat metodlarından da istifadə edilmişdir. Empirik məlumatların təhlili mövcud vəziyyəti qiymətləndirməyə kənd təsərrüfatı sektorundaki irəliləyişlərinin vətəndaşlar üçün gətirdiyi üstünlükləri göstərməyə imkan verir. Bu tədqiqat metodlarının seçimi mövzunun dərindən öyrənilməsi və kənd təsərrüfatı sektorunun inkişaf üzrə təhlilin aparılması üçün zəruri olmuşdur.

Hər bir dövlətin kənd təsərrüfatının inkişafı ölkənin kənd təsərrüfatı üçün əlverişli şəraitə malik olan torpaqlarından asılı olmaqla birlikdə ölkədə tətbiq olunan kənd təsərrüfatı siyasəti həmin inkişafı müəyyən edir. Kənd təsərrüfatısiyasətləri ölkənin həyata keçirdiyi ümumi iqtisadi siyasətin bir hissəsi hesab edilir. Kənd təsərrüfatının inkişafına təsir edən aqrar sektorun xüsusiyyətləri və həyata keçirilən iqtisadi inkişaf siyasətləri bir-birinə təsir göstərir. Hər bir ölkədə kənd təsərrüfatı sektorun xüsusiyyətləri, onun strukturu, kənd təsərrüfatı torpaqlarının vəziyyəti, istifadəsi və məqsədləri fərqli olduğu üçün ölkələr bu xüsusiyyətlərə görə sektorun inkişafı istiqamətinə uyğun siyasətləri müəyyən edir. Kənd təsərrüfatı eyni zamanda əkinçilik siyasətlərinin müsbət və ya mənfi nəticələrinə görə istehsalda dəyişikliklərə öz təsirini göstərir. Kənd təsərrüfatı istehsalında regionların struktur və coğrafi xüsusiyyətləri təsir göstərən digər amildir. Ölkələr tərəfindən müəyyən edilən kənd təsərrüfatı siyasəti bu xüsusiyyətləri nəzərə alaraq çox vaxt regional əsasda təşkil olunur. Azərbaycanda kənd təsərrüfatı siyasətinin müəyyən

edilməsində və həyata keçirilməsində, yuxarıda göstərilən amillər də nəzərə alınaraq ölkə ərazisində tətbiq edilir (http://www.economy.gov. az /Catalogs/files/file117518093271.doc). Kənd Təsərrüfatı Nazirliyinin tabeliyində kənd təsərrüfatı məhsullarının satışının səmərəli təşkili üçün fermerlərə metodiki tövsiyələrin verilməsi, fermerlərin tədarük şirkətləri ilə əlaqələrinin dəstəklənməsi və fermerlərin xarici bazara çıxışı ilə bağlı məsləhət xidmətlərinin göstərilməsi məqsədi ilə 2017-ci ildə Kənd Təsərrüfatı Nazirliyinin tabeliyində Dövlət Aqrar Ticarət Şirkəti" MMC yaradılmışdır. Dövlət Kənd Təsərrüfatının İnkişafı Mərkəzləri kənd təsərrüfatında xidmət yönümlü fəaliyyətin təşkilini, fermerlərlə işin intensivləşdirilməsini, elektron xidmətlərdən və innovativ texnologiyalardan istifadə ilə bağlı maarifləndirmə işlərinin aparılmasını, kənd təsərrüfatının fəaliyyət istiqamətlərinin müəyyən edilməsini təmin etmək məqsədilə əsası qoyulmuşdur. Bundan əlavə Bazar İnformasiya Kommersiya Mərkəzi Kənd Təsərrüfatı Nazirliyi yanında Kənd Təsərrüfatı Layihələrinin və Kreditlərinin İdarə Edilməsi üzrə Dövlət Xidməti tərəfindən istehsalçılara, emalçılara və digər aqrar təşkilatlara marketinq xidmətlərinin göstərilməsi məqsədi iləyaradılmışdır. AgroMall aqrokompleksi Azərbaycanın ən böyük müasir fermer marketlər şəbəkələrindən biri olub 2017-ci ildən fəaliyyətə başlamışdır. AgroMall şəbəkə sistemini beynəlxalq bölgələr, brendlərin nümayişi, ixtisaslaşdırılmış məhsul bazarları, mədəni istirahət mərkəzi kimi əsaslı sahələrdə fəaliyyət göstərməkdədir. Gələcək illər üçün İKT (İnformasiya-Kommunikasiya Texnologiyaları) strategiyasının və onun bu strategiyaya dair texniki tələblərinin müfəssəl hazırlanması məqsədilə 2019-cu ildə "Elektron Kənd Təsərrüfatı İnformasiya Sisteminin" əsası qoyulmuşdur. Həmin sistemdə heyvanların identifikasiyası və qeydiyyatı sistemini yaradılması, baytarlıq nəzarəti xidməti iş prosesini avtomatlaşdıracaq "Baytarlıq İnformasiya Sisteminin" əsasının qoyulması, bitki növləri və toxumları üzrə sınaqların aparılması, tarla fəaliyyətlərinə mərkəzi aparatdan nəzarət etmək məqsədilə "Sınaq-Monitorinq İnformasiya Sisteminin" yaradılması, məhsuldarlığı artırmaq, torpağın keyfiyyətini qorumaq və fermerlərə tövsiyələr vermək üçün "Torpaq Təhlili Sisteminin" formalaşdırılması nəzərdə tutulmuşdur. Bundan əlavə qeyd edilən sistemdə İKT xidmətlərinin göstərilməsi üçün elektron xidmətləri inkişaf etdirmək (məsələn, hava şəraiti, məhsulun sağlamlığı, torpağın rütubəti, həmçinin məhsul yığımı üçün təqvim/proqnoz üzrə mobil/onlayn Azərbaycanın kənd təsərrüfatı məhsullarının ixracının hazırkı vəziyyəti və gələcək perspektivlərinə dair ikitərəflivə çoxtərəfli aspektlər də irəli sürlmüşdür (https://e-qanun.az/framework/43940//Elektron kənd təsərrüfatı" informasiya sistemi haqqında Əsasnamə"nin təsdiq edilməsi barədə//).

Bundan əlavə, Azərbaycan Respublikası hökuməti digər sahələrdə olduğu kimi kənd təsərrüfatı sektoru ilə də beynəlxalq iqtisadi və maliyyə qurumları ilə əməkdaşlıq etməkdədir. Azərbaycan ÜTT- ilə (Ümumdünya Ticarət Təşkilatı) kənd təsərrüfatı və Avropa üzrə sazişlərə uyğun olaraq Avropa İttifaqına daxil olmaq istəyinin uzun müddət mövcudluğunu nəzərə alaraq, alınan qərarlara görə kənd təsərrüfatı siyasəti və beynəlxalq ticarətin inkişaf səviyyəsi çərçivəsində müəyyən edilir. Azərbaycan Ümumdünya Ticarət Təşkilatına (ÜTT) üzv olmaq prosesindədir. Bu kontekstdə Azərbaycan müvafiq ÜTT üzvləri ilə kənd təsərrüfatına daxili dəstək və ixrac subsidiyaları ilə bağlı çoxtərəfli danışıqları davam etdirir. Kənd təsərrüfatını güclü və rəqabətədavamlı etmək məqsədi daşıyan son hadisələri və gələcək planları, eləcə də üzv ölkələrin əvvəlki istəklərini nəzərə alaraq, Azərbaycanın məqsədi 10% "de minimis" səviyyəsinə nail olmaq üçün inkişaf etməkdə olan ölkə kimi yanaşılmaqdır. ÜTT-nin Kənd Təsərrüfatı üzrə Sazişinin 6.2-ci maddəsinin müddəalarından faydalanmaq kimi. Azərbaycan hazırda kənd təsərrüfatının ixracına heç bir subsidiya tətbiq etmir və yerli kənd təsərrüfatına dəstək səviyyəsi təxminən 12%-dir. 2014-2016-cı il təqvim illərini əks etdirən kənd təsərrüfatı cədvəlləri, eləcə də

ÜTT üzvlərinin yerli kənd təsərrüfatına dəstək cədvəlləri ilə bağlı suallarına cavablar ÜTT Katibliyi tərəfindən 2017-ci ilin iyun ayında ÜTT üzvləri arasında yayılıb. Bu kontekstdə Azərbaycanın ÜTT-yə üzv olması ilə bağlı ÜTT-nin sonuncu İşgüzar İclası, eləcə də kənd təsərrüfatına daxili dəstək üzrə çoxtərəfli görüş 2017-ci ilin iyul ayında İsveçrənin Cenevrə şəhərində keçirilmişdir. Bundan əlavə Kənd Təsərrüfatı Nazirliyi FAO, GTZ, TİKA, Beynəlxalq Yardım vəİnkişaf Agentliyi (USAID), Dünya Bankı, Asiya İnkişaf Bankı, İslam İnkişaf Bankı, IFAD, Avropa Komissiyasının Qida Təhlükəsizliyi Proqramı, Avropa İttifaqı və onun TACIS proqramı Beynəlxalq Elm Mərkəzlərində kommersiya olaraq əlaqələr genişləndirilmiş, bu qurumların maliyyə və texniki yardımları genişləndirilməsinə həyata keçirilən beynəlxalq layihələr öz təsirini göstərmişdir (Teymurov E 2018; 21 p).
Ölkədə aqrar sahədə aparılan islahatların səmərəliliyinin artırılması, bazarın iqtisadi şəraitində fəaliyyət göstərməsinə imkan yaratmaq, yeni kənd təsərrüfatı sektoru infrastrukturları beynəlxalq təcrübə və qabaqcıl texnologiyalar hazırlamaq və istehsalata tətbiq etmək məqsədilə beynəlxalq təşkilatlar tərəfindən həyata keçirilən layihələrdən geniş istifadə olunur və bu layihələr uğurlu şəkildə həyata keçirilir. TACIS proqramının 6 lahiyəsi olan "Kənd Təsərrüfatı Nazirliyinə obyekt yardımı", "Ailə və fərdi təsərrüfatlara yardımı", "Rayon Kənd Təsərrüfatı İslahatı Layihəsi-1", "Kənd Təsərrüfatı Sahəsində Bank Fəaliyyətinə Yardım", "Kənd Kredit Təşkilatlarının Təşkili", "Kənd Təsərrüfatı Ticarətinə Regional Pilot Yardım Assosiasiyaları", "Kənd Təsərrüfatı Kredit Fondunun gələcək inkişafı" layihələri həyata keçirilmişdir. Dünya Bankının töhfələri iləkənd təsərrüfatı sahəsində "Kənd təsərrüfatı sektorunda özəl müəssisələrin dəstəklənməsi", "İnteqrasiya Qida Təminatı" və "Kənd Təsərrüfatı Siyasəti Tövsiyələri" lahiyələri tətbiq edilmişdir. Digər layihələr isə Hollandiyanın "Azərbaycanda Kartof Toxumlarının İnkişafı və Bazanın yaradılması" və "Süni Mayalanma Xidmətinin yaradılması" kimi 2 lahiyə, Yaponiya Dövləti "Uzun məsafədən zond üsulu ilə Azərbaycanda bitki örtüyü və torpaqdan İstifadə İnventarları" kimi lahiyələr reallaşdırılmışdır. Bundan əlavə "Bitkilərin Sağlamlığı üzrə Xidmətlərin İcrası", "Baytarlıq sahəsinə dəstək üçün peyvənd yardımı", "Dağ və Yüksək Dağ Əraziləri İnkişaf Layihəsi" və Avropa Komissiyasının "Qida Təhlükəsizliyi" proqram və layihələr fəaliyyət göstərmiş və bəziləri bu gün də fəaliyyət göstərməyə davam edirlər (Azərbaycan Respublikasının Kənd Təsərrüfatı Nazirliyi, 2017: "Qanunlar və Proqramlar", http:// www.agro.gov.az). TİKA-nın təşəbbüsü ilə Azərbaycan-Türkiyə Toxumçuluq və Araşdırma Birgə Təşkilatda taxıl əkini ilə bağlı tədbirlər davam etdirilmişdir. Həmin proqram çərçivəsində Abşeron, Gəncə, Qubada müasir aqrokimya laboratoriyaları ən müasir texnologiyalarla təchizat tətbiq edilərək baytarlıq sahəsində 2 layihə hazırlanmış və TİKA-nın Bakı ofisinə təqdim olunmuşdur. GTZ tərəfindən planlaşdırılan "Özəl Sektorun Dəstəklənməsi" proqramı Zaqatala və Astarada 200-dən çox fermeri əhatə edən "Çay Sektorun İnkişafı Layihəsi" çərçivəsində icrası davam etdirilmişdir. ATƏM ilə kommersiya əməkdaşlığı qurulmuş, Kənd Təsərrüfatı Nazirliyi tərəfindən 6 mikrolayihə eləcədə bu çərçivədə şüşə istehsalı, zeytun istehsalının inkişafı üçün layihələr qurumun Bakı ofisinə təqdim edilmişdir. Dünya Bankının maliyyələşdirməsi sayəsində "Kənd Təsərrüfatı Vahidləri və Əraziləri" Özəlləşdirmə" layihəsi və "Kənd təsərrüfatı sektorunun inkişafı və "Kreditləşdirmə" layihəsinin birinci mərhələsi yekunlaşmışdır. "Kənd təsərrüfatı İnvestisiyalar" layihəsi ölkənin 3 regionunda: Muğan-Salyan, Şirvan yaylası və Naxçıvanda Muxtar respublikada həyata keçirilmişdir. Layihə çərçivəsində 400-500 mikrolayihənin maliyyələşdirilməsi nəzərdə tutulmuşdur. Bundan əlavə 2016-cı ildə Bakıda FAO-nun Tərəfdaşlıq və Əlaqələr Ofisinin açılışı olmuşdur. Baş verən bu hadisə Azərbaycan və FAO arasında əməkdaşlıqda mühüm bir mərhələ hesab edilir. Həmin tərəfdaşlığın davam etdiyi müddətdə işi gücləndirəcək istiqamətdə ümumi məqsədlərə nail olmaq

yolunda birgə işləmək üçün yeni üfüqlər açılmışdır. Beş illik müddətə başlayan tərəfdaşlıq, milli səviyyədə kənd təsərrüfatı, kənd yerlərinin inkişafı, ərzaq təhlükəsizliyi, bitkiçilik və heyvandarlıq istehsalının yaxşılaşdırılması, heyvan sağlamlığı, bitkilərin mühafizəsi və digər sahələrdə investisiyalar üçün əlverişli mühitin yaradılması kimi prioritet fəaliyyətlərə diqqət yetirmişdir. Bununla birlikdə FAO-nun 2016-2020-ci illər üçün Ölkə Proqramlaşdırma Çərçivəsində müəyyən edilmiş potensialın yaradılması siyasət və institusional çərçivənin gücləndirilməsi nəzərdə tutulmuşdur.
Almaniya-Azərbaycan iqtisadi əlaqələri əməkdaşlığın ən dinamik inkişaf edən sahələrindən biridir. Azərbaycan Almaniyanın Cənubi Qafqazda ən mühüm ticarət və iqtisadi tərəfdaşıdır. 2017-ci ildə ikitərəfli ticarət dövriyyəsi təxminən 1,5 milyard avro təşkil edib və ümumi ikitərəfli ticarətin təxminən 70%-i Azərbaycanın payına düşmüşdür. Almaniya Azərbaycanın kənd təsərrüfatı məhsullarının ixracı üçün strateji bazardır. Hazırda Azərbaycanın Almaniyaya ixracında qeyri-neft sektorunun müəyyən hissəsi kənd təsərrüfatı məhsullarının payına düşür. Azərbaycan Respublikası Almaniyadan da kənd təsərrüfatı məhsulları və texnika idxal etməkdədir. Almaniya Azərbaycan iqtisadiyyatına, xüsusilə qeyri-neft sektoruna yarım milyard avrodan çox sərmayə qoyub. Hazırda Azərbaycanda alman şirkətləri uğurla fəaliyyət göstərir və qeyri-neft iqtisadiyyatının inkişafına öz töhfələrini verirlər. Azərbaycan yaxın illərdə Almaniyaya kənd təsərrüfatı məhsullarının ixracını artırmaq niyyətindədir. Bu baxımdan Azərbaycan Almaniyada keçirilən müxtəlif beynəlxalq ərzaq və kənd təsərrüfatı sərgilərində (“Beynəlxalq Yaşıl Həftə”, “ProWein”, “Anuga”, “FruitLogistica” və s.) mütəmadi olaraq milli stendlə iştirak edir. Bundan əlavə, Azərbaycan hər il Bakıda “CaspianAgro” adlı beynəlxalq kənd təsərrüfatı sərgisini təşkil edir. Bu, Azərbaycana öz kənd təsərrüfatı məhsullarını nümayiş etdirmək, aqroturizmi təbliğ etmək, “B2B” görüşlər keçirmək və şəbəkələşməni genişləndirmək imkanı verir.“Made in Azerbaijan” brendinin daha da təşviqi məqsədilə 2017-ci ildə Azərbaycan bir sıra milli şirkətlərin iştirakı ilə Almaniyaya ilk ixrac missiyasını təşkil edib. Azərbaycan Almaniyadan yüksək məhsuldarlığa malik toxum idxalına, mürəkkəb kənd təsərrüfatı texnologiyalarına, eləcə də məhsulun rəqəmsallaşdırılması sahəsində Almaniyanın təcrübəsini və qabaqcıl təcrübələrini öyrənməyə xüsusi maraq göstərməkdədir. Bu istiqamətdə Azərbaycan Almaniyanın müvafiq şirkətləri ilə (məsələn, “CLAAS GlobalSales”, “Haller”, “Rapunzel”, “Holmer” və s.) əməkdaşlıq edir. Bundan başqa, “AzGranata” MMC-nin törəmə müəssisəsi olan “GranataGmbH and Co. KG” Berlində fəaliyyət göstərərək nar şərabı şirəsi satışı üzrə ixtisaslaşmışdır (Teymurov E 2018; 21 p).
Kənd təsərrüfatı sahəsində aparılan tədqiqatların nəticələrinə əsasən müəyyən edilmişdir ki, təsərrüfatlarda becərmə sisteminin formalaşmasında növbəli əkin sisteminin tətbiqi, torpağın becərilməsi, gübrələrdən və toxumlardan istifadə etməklə bitkilərin mühafizəsi kimi əsas amillər iştirak edir. Aparılan çoxsaylı islahatlara baxmayaraq Azərbaycan Respublikası ərazisində əkin sahələrinin intensiv istifadəsi və yanlış kənd təsərrüfatı texnikası nəticəsində onun keyfiyyəti eləcə də məhsuldarlığı aşağı səviyyəyə düşmüşdür. Bu vəziyyət kimyəvi gübrələrin istifadəsinə ehtiyacı artırmış, nəticədə torpaq, su ehtiyatları və bitkilərin sağlamlığı ciddi şəkildə pozulmaya məruz qalmışdır. Azərbaycana kütləvi gübrə idxal edilməsinə baxmayaraq, bu gübrələrin məhsuldarlığı və keyfiyyəti çox aşağı səviyyədədir. Bu baxımdan həm gübrələrin, həm də kimyəvi vasitələrin yerli istehsal hesabına yüksək keyfiyyətli istehsal olunması lazımdır ki, bu da az xərcin çıxmasına səbəb ola bilər. Yeni mineral üzvi gübrə istehsal olunması yaxın müddətdə Azərbaycan Respublikasında məhsulun həcminin, yeni salınan torpaqların münbitliyinin və

iqtisadiyyatının lazımi səviyyədə inkişafına birbaşa təsir göstərir, eyni zamanda digər dövlətlərdən asılı olmadan sərbəst inkişafına şərait yaradır.

**Məqsəd**

Məqalənin məqsədi təbii ehtiyatların istifadəsinin Azərbaycan Respublikasının sosial-iqtisadi inkişafında rolunu müəyyənləşdirməkdir. Çünki təbii ehtiyatlardan səmərəli istifadə edilməsi ölkəmizin inkişaf etdrilməsi yönündə mühüm addım kimi qiymətləndirilməlidir. Təbii ehtiyatlardan istifadənin səmərəli inteqrasiyası ilə yanaşı onların aşkarlanmasına, bu yöndə aparılan geoloji tədqiqat işlərinə xüsusi əhəmiyyət verilməsi mühüm amil kimi özünü göstərir.

**Problemin aktuallığı və əlaqəli tədqiqatlar**

Müasir iqtisadi inkişafı təbii ehtiyatların köməyi olmadan təsəvvür etmək çətindir. Təbii enerji mənbələri arasında neft və qaz ehtiyatları rahat istifadəsinə və faydalılığına görə daha çox seçilir. Dünya sənayesi və nəqliyyatı neft və qaz ehtiyatlarının inhisar sferasına daxil olub. Resursların qeyri-bərabər bölgüsü beynəlxalq əmək bölgüsünə də təsir edir. Sənaye istehsalının əsasını təşkil edən mineral-xammal sektoru dünya iqtisadiyyatında aparıcı mövqe tutur. Bu baxımdan, Azərbaycanın hazırkı mərhələdə artan neft-qaz potensialına, müvafiq ehtiyatların beynəlxalq aləmdə yerləşməsinə, neft hasilatı və emalı ilə bağlı komplekslərin sayına, neft hasilatı və neft emalı ilə bağlı tendensiyalara diqqət yetirmək lazımdır. Qloballaşma və inteqrasiya prosesləri bizi planetin enerji bazasına, onun tələbatının və resurs bazasında potensialının inkişafına nəzər salmağa sövq edir.

**Metodlar**

Məqalənin yazılması zamanı bir neçə metodlardan istifadə olunmuşdur. İlk növbədə faktların toplanılması, məntiqi, analiz və sintez metodlarından istifadə etməklə məlumatlar toplanmış, daha sonra isə tədqiqatın məqsədləri üçün tələb olunan qaydada birləşdirilmişdir. Bundan əlavə, tədqiqat prosesində qrafik, müqayisəli və statistik təhlil metodlarından da geniş istifadə olunmuşdur. Belə ki, bu metodların köməyi ilə Azərbaycan Respublikasında təbii ehtiyatlardan istifadənin müasir vəziyyətinin təhlili aparılmış, təbii ehtiyatların sosial-iqtisadi inkişafa təsiri araşdırılmış, müəyyən müqayisə və təhlillər aparılmışdır.

Azərbaycan Respublikasını dünya ölkələri ilə müqayisə etsək heç mübaliğəsiz demək olar ki, dünyada ikinci bir belə dövlət yoxdur ki, bu qədər yığcam əraziyə malik olsun, buna baxmayaraq təbii sərvətlərlə bu dərəcədə zəngin təmin olunsun. Onun bu üstünlüyü təkcə əhəmiyyətli təbii ehtiyatlarla zənginliyi ilə bağlı deyil, həm də iqtisadiyyatın bütün sahələrinin tələbatını ödəyəcək bütün zəruri təbii sərvətlərlə kifayət qədər bol təmin olunmasından asılıdır.

Ümumilikdə, təbii sərvətlər əhəmiyyətinə və iqtisadi təyinatına görə müəyyən qruplara bölünür.

**Sxem 1.** Təbii ehtiyatların bölgüsü

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

E-ISSN: 2674-5224

VOLUME 26 ISSUE 03 2023




**Mənbə:**Cəfərova R.M., 2014: 42 s.

Əvvəlki Dövlət və Mineral Ehtiyatlar Komitəsinin verdiyi məlumatlara əsasən, Azərbaycan Respublikasında neft və qaz yataqları istisna olmaqla kəşf edilərək dövlət balansında qeydə alınmış qeyri-filiz xammalı, əlvan və qara metallurgiya ehtiyatı, nəcib metal filizi, tikinti materialları, yeraltı su qaynaqları daxil olmaqla təbii ehtiyat yataqlarının sayı 450-dən artıqdır. Bu statistikaya əsasən, belə qənaətə gəlmək olar ki, ölkəmizdə hər 1000 kvadrat km ərazinin payına 5,2 sayda təbii sərvət yatağı düşür. Kəşf edilmiş bu yataqlardan əlavə ölkəmizin ərazisində sonradan aparılmış geoloji tədqiqat işləri nəticəsində ilkin qiymətləndirilmiş sink-qurğuşun, mis-molibden, barıt, qızıl, civə və ayrı-ayrı tikinti materialları olan yataqlar aşkar olunmuşdur. Bu yataqların sayı 213-dür. Əvvəl kəşf olunmuş yataqlarla bərabər bu təbii ehtiyat yataqlarını da nəzərə alsaq, ölkəmizdə hər 1000 kvadrat km əraziyə 8 təbii ehtiyat qaynaqları düşər. Bu statistik göstəricilər kiçik ərazisi olan Azərbaycanın zəngin təbii ehtiyatlara malik olduğunu bir daha sübut edir. Təbii ehtiyatların zənginliyi ölkəmizin güclü iqtisadi potensialından xəbər verir. Belə ki, respublikanın müvafiq strukturları tərəfindən aparılmış hesablamalara görə, ölkəmizin başlıca təbii sərvətlərindən hesab edilən neft-qaz yataqları, su ehtiyatları və balıq ehtiyatları istisna olmaqla, yalnız sənaye ehtiyatları hesab olunan 28 faydalı qazıntı ehtiyatlarının beynəlxalq bazarda qiyməti 40 milyard ABŞ dolları həcmində dəyərləndirilmişdir (https://files.preslib.az/projects/azerbaijan/gl1.pdf).

Təbii sərvətlərlə zəngin təmin olunan Azərbaycanın əsas zənginliyini neft və qaz ehtiyatları təşkil edir. Respublikada aşkar edilmiş neft-qaz ehtiyatlarının bir hissəsi Xəzər dənizində, ölkəmizin quru sahələrində isə əsasən Abşeron, Mərkəzi Aran, Şabran-Siyəzən və s. ərazilərin payına düşür. Belə ki, bu günə qədər kəşf edilən neft və qaz yataqlarının sayı kifayət qədərdir. Dənizdə 8 neft-qaz yatağı kəşf olunmuşdur ki, onlardan 19-da hasilat işləri aparılmaqdadır. Quruda isə 53 neft-qaz yatağı kəşf olunmuşdur ki, bu yataqların 40-ı işləmədədir

(https://report.az/energetika/azerbaycanda-indiyedek-kesf-olunan-neft-qaz-yataqlarin-sayi-aciqlanib/).

Lakin bu göstəricilər müvəqqəti xarakter daşıyır. Çünki istər quruda, istərsə də dənizdə neft-qaz yataqları ilə bağlı göstəricilər hələ tam dəqiqləşməyib, bu təbii ehtiyatların yataqlarının kəşfi istiqamətində işlər hələ də aparılmaqdadır. Lakin 150 ildən artıq aparılan tədqiqat işlərinin nəticəsi olaraq demək olar ki, bu müddət ərzində neft və qazın çıxarılmasının intensiv şəkildə davam etməsinə baxmayaraq, bu ehtiyatların əsas hissəsi hələ də yerin tərkindədir. Yerli və xarici mütəxəssislərin bu yöndə aparılan araşdırmaları bu fikri bir daha sübut edir.

Kəşf edilmiş yataqlarda mütəxəssislərin apardıqları hesablamalara əsasən, respublikada müəyyən edilmiş neft ehtiyatının ümumi həcminin 9 milyard ton, təbii qaz ehtiyatının isə 10 trilyon kubmetr olduğu ehtimal edilərək təsdiqlənmişdir (https://files.preslib.az/projects/azerbaijan/gl1.pdf).

Statistikaya əsasən, indiyədək hasilatda olan yataqlardan 2.069 milyard ton neft ixrac edilmişdir ki, bu neftin 1.090 milyard ton dənizdə yerləşən yataqlardan, 0.979 milyard ton isə quruda yerləşən yataqlardan ixrac edilmişdir.

**Qrafik 1. 2017-2021-ci illərdə neft hasilatının həcmi (min. ton)**




| | 2017 | 2018 | 2019 | 2020 | 2021 |
|---|---|---|---|---|---|
| Neft hasilatı (qaz konsedantı ilə birlikdə) | 38688 | 38814 | 37501 | 34532 | 34580 |
| Quruda | 1534 | 1529 | 1521 | 1259 | 1480 |
| Dənizdə | 37154 | 37285 | 35980 | 33273 | 33100 |

**Mənbə:** https://www.stat.gov.az/source/industry/

Qrafik 1-ə nəzər yetirdikdə görürük ki, 2017-ci ildə neft hasilatının ümumi həcmi 38688 milyon ton olmuş, 2018-ci ildə bu göstərici artaraq 38814 milyon ton təşkil etmiş, lakin 2021-ci ildə 2017-ci illə müqayisədə 4,108 ton azalma müşahidə edilmiş, 34580 milyon ton həcmində neft hasil edilmişdir.

2022-ci ilin hesabatlarına əsasən ölkəmizdə 11,1 milyon ton (kondensatla birlikdə) neft hasil edilib. Neft hasilatında 2021-ci illə müqayisədə 409 min ton azalma müşahidə edilib.

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023

Belə ki, 2022-ci ildə ölkəmizdə hasil edilən 7 milyon ton neft "Azəri-Çıraq-Günəşli", 1,5 milyon ton "Şahdəniz" yatağından çıxarılıb. Neft hasilatının 2,6 milyon tonu SOCAR-ın payına düşüb (https://modern.az/iqtisadiyyat/348007/azerbaycanin-neft-istehsali-azalib-qaz-hasilati-artib-statistika/).

2022-ci ildə yanvar-aprel ayları ərzində 9 milyon ton neft ixrac edilib ki, bunun da 448 min tonu SOCAR, 8,5 milyon tonu isə konsorsiumun payına düşüb. 2021-ci illə müqayisədə neftin ixraca nəqlində2022-ci ildə 5.3% azalma müşahidə olunub ki, buda 501 min ton neft ixracının azalması kimi qeydə alınmışdır.

Azərbaycan iqtisadiyyatında neft ehtiyatları ilə yanaşı təbii qaz da mühüm rol oynayır. Təbii qaz hasilatının statistik göstəricilərinə əsasən, indiyədək dənizdəki təbii qaz yataqlarından 713 milyard kubmetr, quruda yerləşən yataqlardan isə 139 milyard kubmetr qaz ixrac edilmişdir.

**Qrafik 2.** 2017-2021-ci illərdə qaz hasilatı və əmtəəlik qazın həcmi (mlyn. kub metr)




**Mənbə:** https://www.stat.gov.az/source/industry/

Qrafik 2-yə əsasən deyə bilərik ki, 2017-2021-ci illərin statistik göstəricilərində ildən ilə artım müşhahidə olunmuşdur. 2017-ci ildə qaz hasilatı 28596 milyon ton təşkil etmiş, 2021-ci ilə qədər bu rəqəm 65%-dən çox artımla müşahidə olunmuş, 43867 milyon ton qaz hasil edilmişdir.

Qaz hasilatının artımı təbii olaraq əmtəəlik qazın həcminə də təsir göstərmişdir. Belə ki, 2021-ci ildə əmtəəlik qazın miqdarı 2017-ci illə müqayisədə 56%-ə yaxın artım göstərmişdir. Statistik göstəricilərə əsasən 2017-ci ildə əmtəəlik qaz 18186 milyon ton təşkil etmiş, növbəti illərdə bu göstərici yüksəlmiş, 2021-ci ildə pik həddə çataraq 32578 milyon ton olmuşdur.

2022-ci ildə təbii qaz ehtiyatlarının statistikasına nəzər yetirdikdə, 2022-ci ilin əvvəlində olan ehtiyatlar nəzərə alınmaqla yanvar-iyun aylarında 20406,3 milyon kub metr təbii qaz ehtiyatı olduğu yekun hesabatlarda qeyd edilmişdir. Təbii qaz ehtiyatlarının 86,3%-i hasilatın, 13,7%-i

qalığın sayəsində formalaşmışdır. Ehtiyatın 31,8%-i istehlak, 55,6%-i isə ixrac olunmuşdur. Bundan əlavə təbii qazın 2%-nin itkiyə getdiyi müəyyənləşdirilmiş, 10,6%-i iyul ayına qədər ehtiyat olaraq saxlanılmışdır (https://stat.gov.az/news/index.php?lang=az&id=5289).
İstehlak edilmiş təbii qaz ehtiyatının dinamikasına nəzər saldıqda, istehsal ehtiyacları üçün sərf edilmiş təbii qaz 62,9% təşkil etmiş, 37,1% əhaliyə satılmışdır.
2022-ci ildə ixrac olunmuş qaz ehtiyatı 55,6%, yəni 11350,3 milyon kub metr təşkil etmişdir. 2021-ci illə müqayisə etdikdə bu 26,2% çox təbii qaz ixracının olması kimi qiymətləndirilir.
Əhali tərəfindən istehlak edilmiş qaz ehtiyatı 2021-ci ilə nəzərən 1,9% artmış, 2404,0 milyon kub metr təşkil etmişdir. Qrafik 3-də iqtisadi rayonlar üzrə qaz istehlakının faiz göstəriciləri verilmişdir.

**Qrafik 3.** İqtisadi rayonlar üzrə qaz istehlakı




**Mənbə:** https://stat.gov.az/news/index.php?lang=az&id=5289

Qrafik 3-ə nəzər yetirdikdə məlum olur ki, qaz istehlakının əsas hissəsi Bakı şəhərinin payına düşür, belə ki ümumi statistikaya əsasən 38% təşkil etmişdir. Bakıdan sonra qaz istehlakı üzrə yüksək göstərici 10,90%-lə Abşeron-Xızı iqtisadi rayonunun payına düşür. Gəncə-Daşkəsən, Lənkəran-Astara, Mərkəzi Aran, Qazax-Tovuz iqtisadi rayonları da qaz istehlakı göstəricilərinə görə fərqlənirlər.
Azərbaycan Respublikası Cənubi Qafqaz regionunda neft və qaz ehtiyatı potensialı ilə yanaşı, zəngin yanacaq-energetika ehtiyatlarına malik, eyni zamanda özünü təmin etməyə yetəcək qədər enerji sisteminə sahib ölkədir. Enerji ehtiyatının kifayət qədər olması ölkənin həm regional, həm də beynəlxalq səviyyədə özünəməxsus yer tutmasına vəsilə olmuşdur. Onun Avropanın enerji təhlükəsizliyi sahəsində olan fəal iştirakı geoiqtisadi və geosiyasi mövqeyinin güclənməsinə xüsusi təsir etmişdir (Cabbarova A.İ., Dünyamalıyeva V.R. 2014: s. 240).

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023

**Cədvəl 1.** Enerji istehlakı göstəriciləri

| | 2017 | 2018 | 2019 | 2020 | 2021 |
|---|---|---|---|---|---|
| Ümumi enerji təchizatı-min neft ekvivalentinin tonu (min NET) | 15 506,8 | 15 590,7 | 17 085,6 | 16 642,8 | 17 566,6 |
| İlkin enerji məhsullarının istehsalı | 57 036,0 | 58 133,4 | 61 724,7 | 60 458,3 | 66 202,0 |
| O cümlədən: Xam neft(qaz kondensatı daxil olmaqla | 39 810,4 | 39 939,9 | 38 588,7 | 35 533,3 | 35 583,1 |
| Təbii qaz | 16 967,6 | 17 920,2 | 22 871,8 | 24 712,6 | 30 395,6 |
| Bərpa olunan enerji mənbələri və tullantıları | 258,0 | 273,3 | 264,2 | 212,4 | 223,3 |
| İdxal | 2 521,6 | 2 019,7 | 302,8 | 278,5 | 307,2 |
| İxrac | -43 276,3 | -44 235,5 | -44 417,5 | -43 479,0 | -48 552,9 |

**Mənbə:** https://www.stat.gov.az/source/balance_fuel/

Azərbaycanda enerji ehtiyatının bir hissəsini bərpa olunan enerji mənbələri təşkil edir. Ölkəmiz bərpa olunan enerji mənbələri baxımından zəngin potensiala malikdir. Belə ki, texniki cəhətdən istifadəyə yararlı bərpa olunan enerji mənbələri 27 000 MVt təşkil edir. Bərpa olunan enerji ehtiyatı potensialının 3 000 MVt külək enerjisi, 23 000 MVt günəş enerjisi, 380 MVt bioenerji, 520 MVt dağ çaylarının payına düşür.

Ölkəmiz enerji resursları ilə zəngin olmasına baxmayaraq bərpa olunan enerjidən istifadə hər zaman prioritet məsələ olmuşdur. Belə ki, Preziden İlham Əliyevin enerji təhlükəsizliyi siyasəti sahəsində əsas məqsədlərindən biri ölkəmizdə bərpaolunan enerji potensialından istifadə həcminin artırılması yönündədir.

Statistikaya əsasən Azərbaycanda elektrik enerjisinin ümumi istehsal gücü 7542,2 MVt təşkil edir ki, burada 1304,5 MVt bərpa olunan enerjiyə aid elektrik stansiyalarının payına düşür (https://minenergy.gov.az/az/alternativ-ve-berpa-olunan-enerji/azerbaycanda-berpa-olunan-enerji-menbelerinden-istifade).

Azərbaycanda təbii ehtiyatlarına su ehtiyatları da aiddir. Ölkəmizin ərazisinin fiziki-coğrafi şəraitinin rəngarəngliyi, relyef və iqlim xüsusiyyətləri, bununla yanaşı insan fəaliyyəti hidroqrafik şəbəkənin müxtəlif inkişafını şərtləndirir. Hidroqrafik şəbəkəyə daxil olan əsas su obyektləri - çaylar, göllər və su anbarları respublikanın müxtəlif təbii rayonları üzrə qeyri-bərabər paylanmışdır. Məsələn, çay şəbəkəsinin sıxlığı 0,20 $km/km^2$ (Abşeron-Qobustan) ilə 0,84 $km/km^2$ (Lənkəran) arasında, orta sıxlığı isə 0,36 $km/km^2$-dir.

Azərbaycan ərazisində yerüstü su ehtiyatlarının əsas hissəsi çayların payına düşür. Yerli çaylar əsasən respublika ərazisində formalaşır və onun ərazisindən axırlar. Xarici ölkələrdən mənbəyini götürən çaylar isə tranzit çaylardır. Ölkəmizdə 21 tranzit çay vardır ki, bu çayların əksəriyyətinin mənsəbi Kür və Araz çaylarına aiddir.

Kür və Araz çaylarının hövzələri uyğun olaraq dörd-beş ölkə ərazisində yerləşir. Araz çayı ilə birlikdə Kür çayının payına düşən su ehtiyatları müxtəlif dəyərləndimələrə görə 25,9-26,9 $km^3$ arasında dəyişkən göstəricilərlə əks olunur. Araz çayı istisna olmaqla Kür çayının su ehtiyatı 86 min $km^2$-dir ki, bu ehtiyatın su toplayıcı sahəsindən payı 16-17,8 $km^3$, qonşu ölkələrin ərazisindən daxil olan axın miqdarı 70-71%, yəni 11,7-12,7 $km^3$, yerli axın miqdarı isə 4,50-6,02 $km^3$ təşkil edir (https://files.preslib.az/projects/eco/az/eco_m2_3.pdf).

Araz çayına düşən su ehtiyatı göstəriciləri 102 min km$^2$ su toplayıcı ərazidən 9,10-9,30 km$^3$, payın qonşu ölkələrdən gələn axına düşən hissəsi 85-87%, yəni7,70-8,10 km$^3$, yerli axına düşən payı isə 1,04-1,40 km$^3$ təşkil edir.
Statistikaya görə su ehtiyatlarının Xəzər dənizinə tökülən çaylara düşən payı ümumilikdə 2,17-3,41 km$^3$-dir ki, bu ehtiyatın qonşu ölkələrdən daxil olan hissəsi 0,14 km$^3$, yerli axının payına düşən hissəsi 2,17-3,27 km$^3$ olduğu müəyyənləşdirilmişdir.
Respublika ərazisində yerləşən çayların ümumi su ehtiyyatlarının miqdarı təqribi olaraq 28,1-30,3 km$^3$ olduğu hesablanmışdır. Bu su ehtiyatlarının qonşu ölkələrdən respublika ərazisinə daxil olan axın 67-70% və ya 19,7-20,3 km$^3$, respublika ərazisində əmələ gələn axar suların həcmi isə 7,81-10,6 km$^3$ təşkil edir ki, bu da qonşu ölkələrdən daxil olan axının yerli daxil olandan 2,0-2,5 dəfə çox olduğunu göstərir (https://files.preslib.az/projects/eco/az/eco_m2_3.pdf).
Azərbaycan Respublikası çaylarla yanaşı, göllərlə də zəngindir. Bu göllərin əksəriyyətini kiçik göllər təşkil edir. Sahəsinə görə ölkəmizdə yerləşən ən böyük göl 65,7 km$^2$ olan Sarısu gölüdür.
**Cədvəl 2.** Azərbaycan respublikasının ərazisində yerləşən əsas göllərin morfometrik xüsusiyyətləri.

| № | Göl | Yerləşdiyi yer | Sahəsi, km$^2$ | Həcmi, mln. m$^3$ |
|---|---|---|---|---|
| 1 | Sarısu | Kür-Araz ovalığı | 65,7 | 59,1 |
| 2 | Ağzıbirçala | Dəvəçi rayonu | 13,8 | 10,0 |
| 3 | Göygöl | Kürəkçayın hövzəsi | 0,79 | 24,0 |
| 4 | Hacıqabul | Kür-Araz ovalığı | 8,4 | 12,1 |
| 5 | Böyük-Şor | Abşeron yarımadası | 16,2 | 27,5 |
| 6 | Ağgöl | Kür-Araz ovalığı | 56,2 | 44,7 |
| 7 | Candargöl | Gürcüstanın sərhədi | 10,6 | 51,0 |
| 8 | Böyük Alagöl | Qarabağ vulkanik yaylası | 5,1 | 24,3 |
| 9 | Aşıq-Qara | Həkəriçayın hövzəsi | 1,76 | 10,2 |
| 10 | Qaraçuq | Naxçıvançayın hövzəsi | 0,45 | 2,53 |

**Mənbə:** https://files.preslib.az/projects/eco/az/eco_m2_3.pdf

Təhlillər nəticəsində məlum olur ki, respublikada yerüstü su ehtiyatları ilə yanaşı, yeraltı su qaynaqlarından da istifadə olunur. Belə ki, il ərazində yerüstü su ehtiyatlarından istifadə həcmi 11-12 milyard m$^3$, yeraltı su ehtiyatlarından istifadə payı isə 2,5-2,8 milyard m$^3$-a yaxın olmuşdur (https://files.preslib.az/projects/azerbaijan/gl1.pdf).
Faydalı şirin (1,0 q/l-ə qədər minerallaşma) və az minerallaşmış (1-3 q/l) yeraltı sulara paleozoy süxurlarından tutmuş müasir yataqlara qədər bütün genetik tiplərdə, respublika ərazisində, dağlıq ərazilərdə, həmçinin ölkəmizin dağətəyi rayonlarında qeyri-bərabər paylanmışdır. Dağətəyi və düzənlik ərazilərdə regional istismara yararlı qrunt su ehtiyatları Milli Geoloji Kəşfiyyat Xidməti tərəfindən qiymətləndirilmiş, bəzi ərazilərdə (Qarabağ-Mil, Gəncə-Qazax) son vaxtlar yeraltı su ehtiyatlarının yenidən qiymətləndirilməsi məqsədilə hidrogeoloji tədqiqatlar aparılmışdır.
Azərbaycanın müxtəlif rayonlarında çoxlu sayda qara, əlvan və nəcib metallar, qeyri-filiz xammal və tikinti materialları, şirin, mineral, termal və yod-bromlu sənaye sularının yeraltı yataqları və s. var. Onların arasında mis, qızıl, qurğuşun-sink filizləri və tikinti materialları yataqları xüsusi yer tutur. Yaxın gələcəkdə ölkə sənayesinin inkişafında Filizçay qrupunun iri yataqlarının (Filizçay, Mazımçay, Kasdağ, Katex, Saqator, Kasmala) istismarı mühüm rol oynayacaqdır.

Azərbaycan Respublikasının ərazisində dəmir filizi yataqları da vardır ki, bu ölkəmizin təbii ehtiyatlarla zəngin olduğunu bir daha sübut edir. Sənaye ehtiyatları təsdiq edilmiş və dövlət balansında uçota alınmış faydalı qazıntı yataqları ilə yanaşı, bir çox filiz yataqları üzrə axtarış-geoloji kəşfiyyat işləri aparılmış, onların ilkin ehtiyatları hesablanmışdır.
Bu gün də dəmir filizləri sənayenin və iqtisadi inkişafın əsas sütunlarından biri hesab olunur. Hazırda Azərbaycan ərazisində 3 dəmir filizi yatağının sənaye əhəmiyyətli ehtiyatları təsdiq edilərək etibarlı mineral-xammal bazası yaradılmışdır. Onların hər üçü Daşkəsən filiz rayonunda yerləşir və Daşkəsən, Cənubi Daşkəsən və Dəmir kobalt-maqnetit yataqları ilə təmsil olunur. Qeyd edək ki, Daşkəsən qrupunun yataqları uzun illərdir ki, respublikanın mineral-xammal bazasında xüsusi yer tutur. Bu yataqlar əsasında son illərə qədər Azərbaycan Neft Emalı Zavodu fəaliyyət göstərirdi və onun məhsulları (dəmir konsentratı) Gürcüstanın Rustavi Metallurgiya Zavodunun tələbatını tam ödəyirdi. Yaxın vaxtlarda Daşkəsən filizsaflaşdırma kompleksinin işi bərpa olunarsa, 70-80 illik etibarlı ehtiyatla təmin olunacaq (https://gsaz.az/articles/view/92/Azarbaycanin-faydali-qazintilari).

**Nəticə**

Tədqiqatımız zamanı belə nəticəyə gəldik ki, Azərbaycan Respublikasının sosial-iqtisadi inkişafında təbii ehtiyatları mühüm rol oynayır. Onun iqtisadiyyatının inkişafına, beynəlxalq aləmdə mövqeyini gücləndirir. Bu baxımdan təbii ehtiyatlardan səmərəli istifadə edilməsi ölkəmizin inkişaf etdrilməsi yönündə mühüm addım kimi qiymətləndirilməlidir. Təbii ehtiyatlardan istifadənin səmərəli inteqrasiyası ilə yanaşı onların aşkarlanmasına, bu yöndə aparılan geoloji tədqiqat işlərinə xüsusi əhəmiyyət verilməsi mühüm amil kimi özünü göstərir.
Tədqiqat zamanı müəyyən etdik ki, 2017-ci ildə neft hasilatının ümumi həcmi 38688 milyon ton olmuş, 2018-ci ildə bu göstərici artaraq 38814 milyon ton təşkil etmiş, lakin 2021-ci ildə 2017-ci illə müqayisədə 4,108 ton azalma müşahidə edilmiş, 34580 milyon ton həcmində neft hasil edilmişdir. 2022-ci ilin hesabatlarına əsasən ölkəmizdə neft hasilatında 2021-ci illə müqayisədə 409 min ton azalma müşahidə edilib.
Ölkə əhalisini təhlükəsiz içməli su ilə təmin etmək məqsədilə boru kəmərlərinin və təmizləyici qurğuların tikintisi ilə bağlı irimiqyaslı layihələr həyata keçirilir, mərkəzləşdirilmiş kanalizasiya sistemlərinin bərpası və yeni kanalizasiya şəbəkələrinin qurulması tədbirləri davam etdirilir, mövcud təmizləyici qurğuların modernləşdirilməsi və yenilərinin tikintisi işləri aparılır. Bu günədək ölkədə ekoloji problem kimi aktuallığını qoruyan məişət tullantılarının və yeraltı suların idarə olunması, yaşayış məntəqələrinin kanalizasiya şəbəkəsi ilə tam təmin edilməsi, təmizləyici qurğuların quraşdırılması, su ehtiyatlarından səmərəli istifadə sahəsində çatışmazlıqlar mövcuddur ki, bu çatışmazlıqların aradan qaldırılması ilə bağlı su ehtiyatlarının inteqrasiyalı idarə edilməsi, suyun çirklənməsinin monitorinqi istiqamətində tədbirlər həyata keçirilir. Görülən tədbirlərdən əlavə suyun çirklənməsi, sudan səmərəli istifadə və tullantı sularının idarə edilməsi sahəsində mövcud problemlərin həlli məqsədilə qarşılıqlı əməkdaşlığın gücləndirilməsi, bu işdə qeyri-hökumət təşkilatlarının və ictimaiyyətin fəal rolunun və əhalinin maarifləndirilməsinin vacibliyi hər zaman mühüm rol oynamalıdır.

## ƏDƏBİYYAT

1. Cəfərova R.M. Tebietden istifadenin iqtisadiyyatı.// ders vəsaiti.-Gəncə: “Gəncə Poliqrafiya ASC”, 2014, 285 s.

2. https://files.preslib.az/projects/azerbaijan/gl1.pdf
3. https://report.az/energetika/azerbaycanda-indiyedek-kesf-olunan-neft-qaz-yataqlarin-sayi-aciqlanib/
4. https://www.stat.gov.az/source/industry/
5. https://modern.az/iqtisadiyyat/348007/azerbaycanin-neft-istehsali-azalib-qaz-hasilati-artib-statistika/
6. https://stat.gov.az/news/index.php?lang=az&id=5289
7. Cabbarova A.İ., Dunyamalıyeva V.R. “Milli hesablar sistemi”.- Bakı: “İqtisad Universiteti” Nəşriyyat, 2014, 240 s.
8. https://www.stat.gov.az/source/balance_fuel/
9. https://minenergy.gov.az/az/alternativ-ve-berpa-olunan-enerji/azerbaycanda-berpa-olunan-enerji-menbelerinden-istifade
10. https://files.preslib.az/projects/eco/az/eco_m2_3.pdf
11. https://gsaz.az/articles/view/92/Azarbaycanin-faydali-qazintilari

# ОБЩАЯ ХАРАКТЕРИСТИКА ИСПОЛЬЗОВАНИЯ ПРИРОДНЫХ РЕСУРСОВ В АЗЕРБАЙДЖАНСКОЙ РЕСПУБЛИКЕ

**Айнур Джаббарова [1], Ильгар Аскерли[2]**
[1,2] Азербайджанский государственный экономический университет
[1,2] кафедра Экономики и технологических наук
[1]доцент, кандидат экономических наук
[2]магистрант

## РЕЗЮМЕ

Подземные полезные ископаемые в Азербайджане, являясь составной частью общих природных ресурсов, являются одним из основных факторов, обуславливающих экономическую и социально-политическую независимость нашей страны. Рост экономического потенциала Азербайджанской Республики обусловлен эффективным использованием ресурсов различных месторождений полезных ископаемых, открытых на ее территории, развитием горнодобывающей и перерабатывающей промышленности. По этой причине значение минеральных ресурсов в современную эпоху неуклонно растет. Если посмотреть на экономическое развитие, макроэкономические показатели нашей страны в настоящее время, то можно увидеть, что важную роль здесь играет нефтегазовая промышленность. Влияние нефтегазовой промышленности также отражается на промышленном производстве, доходах бюджета, объемах инвестиций и экспорта. Экономическое развитие за счет доходов от нефти и газа является мощным стимулом для улучшения региональной инфраструктуры, развития ненефтяного сектора и создания новых рабочих мест. Нефтегазовый потенциал Азербайджана, имеющаяся инфраструктура позволяют обеспечить продолжение добычи здесь более высокими темпами.

В статье рассматриваются объемы нефтегазодобычи в нашей стране, показатели энергопотребления, морфометрические характеристики основных озер, расположенных на

территории Азербайджанской Республики, функция надежной минерально-сырьевой базы железорудных месторождений, основные принципы обеспечения энергетической безопасности и др. это было исследование таких вопросов.
**Ключевые слова:** природные ресурсы, нефтегазовые месторождения, энергетическая система, водные ресурсы, месторождения железной руды

Publication history

Article received: 08.02.2023
Article accepted: 24.02.2023
Article published online: 14.03.2023
DOI suffix: 10.36962/PAHTEI26032023-165

E-ISSN: 2674-5224
177-189 VOLUME 26 ISSUE 03 2023
ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

# ANALYSIS OF CASHLESS PAYMENTS SYSTEM IN THE REPUBLIC OF AZERBAIJAN

**Pashajanov Anar[1], Nijat Huseynov[2]**
[1,2] Azerbaijan State University of Economics, [1,2] Department of Economics and Technological Sciences
[1] Candidate of economic sciences
[2] Master student, nicat689@bk.ru

## ABSTRACT

The market of payment instruments and technologies is constantly evolving. However, in order to implement new tools, it is necessary to determine their relevance to the needs of payment service users. A payment instrument is understood as a method of carrying out a payment transaction, including forms of non-cash settlements and electronic payments, that is, in essence, it is a form of an order or message for the transfer of funds. According to the number of transactions performed in the structure of payments, the most common payment instrument is settlements using bank orders, transactions based on payment orders and transfers of natural persons without opening an account. Due to the development of modern technologies, remote forms of account management are more and more in demand, because it can significantly speed up the business process and save money by eliminating the procedures for issuing paper documents.
E-commerce in Azerbaijan is growing day by day, which in turn creates an opportunity to pay and buy goods online, and this encourages the development of a cashless payment system. The Ministry of Taxes has implemented one of the important projects for the development and wide application of this system. This is the AsanImza mobile digital signature project. This project played an important role in the development of the cashless payment system. Thanks to the implementation of the "AsanImza" project, online and mobile banking began to develop, and in turn, the development of online and mobile banking led to the expansion of the use of cashless payment systems. The "AsanImza" project became popular in a short time, and the reason for this was the convenient AsanImza mechanism. Thanks to this, it has become more convenient for people to make cashless payments. To make calculations. There is no need to go to the bank and stand in queues to pay for services. In other words, cashless payment users are increasing.
In order to expand digital payments in 2018-2020, the State Program approved by the President of Azerbaijan Ilham Aliyev fully ensured the ownership and contractual rights of entrepreneurs in order to make the country's economy transparent, improved the tax system in efficient markets, and eliminated tax evasion.
Payment cards are one of the most dynamically developing segments of non-cash payment instruments. A positive trend is observed in the number of issued bank cards, which indicates that the majority of the population prefers this type of banking products. A significant increase in the volume of non-cash retail payments using bank cards was helped by the expansion of the range and infrastructure of payment services provided by credit organizations to customers using them. Thus, we can note that the demand for payment instruments has increased in our country, as well as the share of non-cash payments. However, despite the increase in indicators characterizing the level of development of non-cash payments, the situation in Azerbaijan is still far from the level of developed countries. Transferring funds to accounts opened in foreign banks is a complicated process. In this case, emergency money transfer systems will not help. For such transfers, the

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023

S.W.I.F.T system is used, where transfers are made as accurately as possible. One of the distinguishing features of this system from others is that you must record the recipient's information when making transfers. You should be extremely careful, because if you enter the information incorrectly, the funds may not enter the recipient's account, in which case the money will be returned to the sender's account after a certain period of time.The article examines the development dynamics of the non-cash payment system and analyzes the current situation of non-cash payments in the payment system.
**Keywords:** non-cash payments, banking sector, interest rate, money transfer system, bank cards

# AZƏRBAYCAN RESPUBLİKASINDA NAĞDSIZ ÖDƏNİŞLƏR SİSTEMİNİN TƏHLİLİ

**Paşacanov Anar[1], Nicat Hüseynov[2]**
[1,2] Azərbaycan Dövlət İqtisad Universiteti, [1,2] "İqtisadiyyat və texnoloji elmlər" kafedrası
[1]iqtisad üzrə fəlsəfə elmləri doktoru,
[2] magistr tələbəsi, nicat689@bk.ru

## XÜLASƏ

Ödəniş alətləri və texnologiyaları bazarı daim inkişafdadır. Bununla belə, yeni alətlərin tətbiqi üçün onların ödəniş xidmətləri istifadəçilərinin ehtiyaclarına uyğunluğunu müəyyən etmək lazımdır. Ödəniş aləti dedikdə, nağdsız hesablaşmaların və elektron ödənişlərin formaları daxil olmaqla, ödəniş əməliyyatının həyata keçirilməsi üsulu başa düşülür, yəni mahiyyət etibarı ilə bu, pul vəsaitlərinin köçürülməsi barədə əmr və ya mesaj formasıdır. Ödənişlərin strukturunda yerinə yetirilən əməliyyatların sayına görə ən çox yayılmış ödəniş aləti bank sifarişindən istifadə etməklə hesablaşmalar, ödəniş tapşırıqları əsasında aparılan əməliyyatlar və hesab açılmadan fiziki şəxslərin köçürmələridir. Müasir texnologiyaların inkişafı ilə əlaqədar olaraq, hesabın idarə edilməsinin uzaq formaları getdikcə daha çox tələb olunur, çünki bu, kağız sənədlərin verilməsi prosedurlarını aradan qaldırmaqla iş prosesini əhəmiyyətli dərəcədə sürətləndirə və pula qənaət edə bilər. Ödəniş kartları nağdsız ödəniş alətlərinin ən dinamik inkişaf edən seqmentlərindən biridir. Buraxılan bank kartlarının sayında müsbət tendensiya müşahidə olunur, bu da əhalinin əksəriyyətinin bu növ bank məhsullarına üstünlük verdiyini göstərir. Bank kartlarından istifadə etməklə nağdsız pərakəndə ödənişlərin həcminin əhəmiyyətli dərəcədə artmasına kredit təşkilatları tərəfindən onlardan istifadə edən müştərilərə göstərilən ödəniş xidmətlərinin çeşidinin və infrastrukturunun genişləndirilməsi kömək etmişdir. Beləliklə, ölkəmizdə ödəniş alətlərinə tələbatın artdığını, habelə nağdsız ödənişlərin payının artdığını qeyd edə bilərik. Bununla belə, nağdsız ödənişlərin inkişaf səviyyəsini xarakterizə edən göstəricilərin artmasına baxmayaraq, Azərbaycanda vəziyyət hələ də inkişaf etmiş ölkələrin səviyyəsindən uzaqdır. Məqalədə nağdsız ödəniş sisteminin inkişaf dinamikasına nəzər yetirilmiş, ödəniş sistemində nağdsız ödənişlərin mövcud vəziyyəti təhlil edilmişdir.
**Açar sözlər:** nağdsız ödənişlər, bank sektoru, faiz payı, pul köçürmə sistemi, bank kartları.

## Giriş

Elektron texnologiyaların inkişafı ilə səciyyələnən müasir şəraitdə nağdsız ödənişlər bütün nağd pul axınının böyük əksəriyyətini əhatə edir. Nağdsız dövriyyənin inkişaf dərəcəsi iqtisadi inkişafın ümumi səviyyəsinin və maliyyə infrastrukturunun və kredit təşkilatlarının yetkinliyinin müəyyən göstəricisi kimi çıxış edir. Müasir şəraitdə nağdsız ödənişlərin faiz payı daim artır, çünki onlar iqtisadiyyatın yeni sahələrinə daxil edilir. Bundan əlavə, onların hesablaşmaların həyata keçirilməsində öz vəsaitlərinin ən rahat istifadəsini təmin edən formaları da inkişaf edir. Nağdsız ödənişlər müəyyən bir sistemə uyğun olaraq təşkil edilir ki, bu da nağdsız ödənişlərin təşkili prinsiplərinin məcmusu, onların təşkilinə tətbiq olunan, konkret iş şəraiti ilə müəyyən edilən tələblər kimi başa düşülür.

**Məqsəd**

Məqalənin məqsədi Azərbaycanda nağdsız ödəniz sisteminin ümumi vəziyyətinin qiymətləndirilməsidir. Bu məqsəddən asılı olaraq nağdsız ödənişlərin faiz payını dəyərləndirmək əsas vəzifə seçilmişdir.

**Problemin aktuallığı və əlaqəli tədqiqatlar**

Nağdsız ödəniş sisteminin mövcud vəziyyəti Azərbaycanda hazırda ən aktual məsələlərdən biridir. Nağdsız ödənişlər sisteminin tam avtomatlaşdırılması bank sənəd dövriyyəsinin sadələşdirilməsi, ödəniş müddətlərinin azaldılması üçün böyük əhəmiyyət kəsb edir və hesablaşma sənədlərinin qanunsuz əldə edilməsinə zəmanət verə biləcəkdir. Bu cəhətdən bu sahədə olan problemlərin aradan qaldırılması istiqamətində müsbət tədbirlər görülmüşdür.

**Metodlar**

Məqalədə müşahidə, müqayisə, analiz, sintez, induksiya və deduksiya metodlarından istifadə edilmişdir. Bu metodlar təkcə faktların toplanmasına deyil, həm də onları yoxlamağa, sistemləşdirməyə, qeyri-təsadüfi asılılıqları müəyyən etməyə kömək edir. Bu tədqiqat metodları toplanmış faktların məntiqi tədqiqini həyata keçirməyə, nəticə çıxarmağa və nəzəri ümumiləşdirmələr aparmağa imkan verir.

Azərbaycan Mərkəzi Bankı 2021-ci ildə ölkədə nağdsız ödənişlərin həcminin 2020-ci illə müqayisədə 83% artaraq 11 milyard 172 milyon manat təşkil etdiyini qeyd edir. 2021-ci ildə elektron ticarətin həcmi 7 milyard 208 milyon manat (artım 86 faiz) və ya bütün nağdsız ödənişlərin 64,5 faizini təşkil edib. Bundan əlavə, pos-terminallar vasitəsilə (artım 80,8%) 3 milyard 927 milyon manat, bankomatlar vasitəsilə isə 37 milyon manat ödəniş həyata keçirilib. 2021-ci ildə dövriyyədə olan ödəniş kartlarının sayında artım olub. O cümlədən, il ərzində onların sayı 19,6% artaraq 11 milyon 40 min ədədə çatıb.Eyni zamanda dövriyyədə olan debet kartlarının sayı 19%, kredit kartlarının sayı 28% artıb. 2021-ci ildə Azərbaycanda əmək haqqı kartlarının sayı 90 min ədəd artaraq 2,591 milyon ədədə, kredit kartlarının sayı 302 min ədəd artaraq 1,395 milyon ədədə çatıb (Azərbaycan Respublikası Mərkəzi Bankının "Debet və kredit kartları vasitəsilə aparılan əməliyyatların sayı və həcmi haqqında statistik hesabatı, 2021, s.2).

2022-ci ilin əvvəlinə 3,469 milyon sosial ödəniş kartı və 3,585 milyon digər kart da dövriyyədədir. Bu gün ölkə banklarının 84%-i mobil proqramlardan istifadə edir, bank müştərilərinin əməliyyatlarının 77%-i elektron bankçılıq (mobil və internet bankçılıq) vasitəsilə həyata keçirilir. İnternet bankçılığa gəlincə, bu ilin 10 ayı ərzində əməliyyatların həcmi ötən ilin müvafiq dövrü ilə müqayisədə 55%, mobil bankçılıq vasitəsilə aparılan əməliyyatlar 3 dəfə artıb.

2022-ci ildə ödəniş kartları vasitəsilə nağdsız ödənişlərin xüsusi çəkisi 42%-i ötüb ki, bu da 2021-ci il ilə müqayisədə 12 faiz çoxdur (Əziz Xəlilov, 2023, s.1).

Azərbaycanda elektron ticarət günbəgün artmaqdadır ki, bu da öz növbəsində onlayn ödəmə və mal almaq imkanı yaradır və bu, nağdsız ödəniş sisteminin inkişafına təkan verir. Bu sistemin inkişafı və geniş tətbiqi üçün Vergilər Nazirliyi mühüm layihələrdən birini həyata keçirmişdir. Bu, "Asanİmza" mobil rəqəmsal imza layihəsidir. Bu layihə nağdsız hesablaşma sisteminin inkişafında mühüm rol oynamışdır. "Asanİmza" layihəsinin həyata keçirilməsi sayəsində onlayn və mobil bankçılıq inkişaf etməyə başladı və öz növbəsində onlayn və mobil bankçılığın inkişafı nağdsız ödəniş sistemindən istifadənin genişlənməsinə səbəb oldu. "Asanİmza" layihəsi qısa müddətdə populyarlaşdı və buna səbəb rahat Asanİmza mexanizmi idi. Bunun sayəsində insanlar üçün nağdsız ödənişlər aparmaq daha rahat olub. Hesablamalar aparmaq üçün. Xidmətlərin ödənişi üçün banka getmək və növbələrdə dayanmaq lazım deyil. Başqa sözlə, nağdsız ödəniş istifadəçiləri artır.

2018-2020-ci illərdə rəqəmsal ödənişlərin genişləndirilməsi məqsədilə Azərbaycan Prezidenti İlham Əliyev tərəfindən təsdiq edilmiş Dövlət Proqramında ölkə iqtisadiyyatının şəffaf olması üçün sahibkarların mülkiyyət və müqavilə hüquqlarının tam təmin edilməsi həyata keçirilmiş, fəaliyyəti səmərəli olan bazarlarda vergi sistemi təkmilləşdirilmiş, vergidən yayınma hallarını da aradan qaldırılmışdır (Azərbaycan Respublikası Mərkəzi Bankının rəsmi internet səhifəsi).

Bu proqramın icrası nəticəsində nağdsız ödənişlərin payı 7% artmışdır. Proqram həm də Azərbaycanda nağd ödənişlərin payının 74%-dən 40%-ə azalmasına səbəb olmuşdur. Proqramda həmçinin bank sektorunun inkişafına, bütün regionlarda bank xidmətlərinin əlçatanlığının təmin edilməsinə diqqət yetirilmiş, bu sektorda rəqabətin artması, aktiv pul bazarının yaradılması, eləcə də pul bazarının yaradılmasına gətirib çıxaracaq tədbirlərdən söz açılmışdır.

Əməliyyatlarda nağdsız ödənişlərin payını artırmaq sahəsində proqramın aşağıdakı nəticələrini qeyd etmək lazımdır: (Sadıqov E., 2010, s.138)

- Vergi sisteminin səmərəliliyi ilə bağlı tədbirlər nağdsız dövriyyənin ildə 3 milyard manat artmasına səbəb olmuşdur;
- Qeyri-rəsmi məşğulluğun azalması;
- Bank sisteminin səmərəli fəaliyyəti üçün tədbirlər;
- Aktiv pul bazarının formalaşdırılması;
- Ödəniş xidmətləri üzrə qanunvericilik bazasının təkmilləşdirilməsi;
- Yeni rəqəmsal ödəniş texnologiyalarının tətbiqi;
- Bank sisteminin rəqəmsallaşdırılması;
- Əhalinin maliyyə savadlılığının artırılması.

Yuxarıdakı məlumatlardan da göründüyü kimi, dövlət proqramının əsas məqsədi nağdsız ödənişlərin payının genişləndirilməsi və bank sektorunun gücləndirilməsidir. Bu məqsədlərə nail olmaq üçün nağdsız ödənişlər üzrə qanunvericilik bazasının təkmilləşdirilməsi, habelə nağdsız ödənişlər üzrə xidmətlərin keyfiyyətinin və səmərəliliyinin artırılması mühüm tədbirlərdən ibarətdir (Azərbaycan Respublikası Mərkəzi Bankının "Banklarda İnformasiya Texnologiyalarının tətbiqi qaydaları", 2014, s.6).

MasterCard-ın Azərbaycan üzrə meneceri Erdem Çakarın sözlərinə görə: "2018-ci ildə Azərbaycanda POS terminallar vasitəsilə ödənişlər ölkənin ÜDM-nin 3-4 faizini təşkil edib (2018-ci ilin yanvar-oktyabr aylarında 65,2 milyard manat). Menecerin sözlərinə görə, eyni

göstərici Türkiyədə 40 faiz, Böyük Britaniyada 50 faiz, İsveçdə 70 faiz olub (https://faktxeber.ru/News_h466868.html, 2018).

Azərbaycanda dövlət tərəfindən həyata keçirilən islahatlar nəticəsində nağdsız ödənişlərin populyarlığının artması, eləcə də bank hesablarının sayının artması müşahidə olunur. Bütün dünyada nağdsız ödənişlərin ən çox yayılmış növü kartlardır ki, onların köməyi ilə onlayn alış-veriş etmək çox asandır. Amma təəssüf ki, Azərbaycanda əksər vətəndaşlar kartdan pul çıxarmağa və nağd əməliyyatlar aparmağa üstünlük verirlər. Nağdsız əməliyyatların payının artırılması pul vəsaitlərinin hərəkətini təmin etmək üçün xərclərə qənaət etməyə kömək edir. Nağd pul əskinasları ölkədə inflyasiyanın səviyyəsinə təsir edə bilər. Nağd pulun iqtisadiyyatda yüksək payı olsa da, inflyasiya yüksək ola bilər.

2016-cı ilin sonunda Azərbaycan parlamenti "Nağdsız hesablaşmalar haqqında" qanunu qəbul etdi. Qəbul edilən qanuna əsasən, Azərbaycanda 2017-ci ildən ticarət və ictimai iaşə kimi sahələrdə fəaliyyət göstərən iri sahibkarlar üçün nağd ödənişlər ayda 30 000 manatadək məhdudlaşdırıldı. Onu da qeyd edək ki, bu məhdudiyyət 12 ay ərzində aylıq dövriyyəsi 200 min manatdan çox olan sahibkarlara şamil edilir. Qalan vergi ödəyiciləri üçün isə bu limit aylıq 15.000 AZN təşkil edir (Azərbaycan Respublikası Mərkəzi Bankının "Debet və kredit kartları vasitəsilə aparılan əməliyyatların sayı və həcmi haqqında statistik hesabatı, 2021, s.2).

Bu qanun pozulduqda, onu pozanlar müəyyən sanksiyalar ödəməlidirlər ki, onların məbləğləri aşağıdakılardır:

- həyata keçirilmiş əməliyyatların 10 faizi,
- pozuntu ikinci dəfə törədildikdə, həyata keçirilmiş əməliyyatların 20 faizi,
- üçüncü dəfə və ya daha çox törədildikdə isə, həyata keçirilmiş əməliyyatların 40 faizi.

8 dekabr 2016-cı il tarixindən "Azərbaycanın rezidentləri və qeyri-rezidentləri tərəfindən valyuta əməliyyatlarının aparılması Qaydaları" qəbul edilmişdir. Bu qaydalar fiziki şəxslərin (rezidentlər və qeyri-rezidentlər) bank hesabı açmadan xarici valyutada köçürmələrinə qoyulan məhdudiyyətləri nəzərdə tutur. Belə ki, bu qaydalara əsasən, fiziki şəxslər (rezidentlər və qeyri-rezidentlər) gündə 1000 ABŞ dollarından (ekvivalentindən), ayda isə 10 min dollardan (ekvivalentdə) artıq olmayan vəsaiti bank hesabı açmadan köçürə bilərlər. Və 1000 dollardan çox məbləğ göndərmək lazımdırsa, o zaman bank hesabı açmaq məcburidir. Bu qanun qüvvəyə minməzdən əvvəl bu limit 30 000 ABŞ dolları idi. Qeyd edək ki, rezident fiziki şəxslər yaxın qohumlarına vəsait köçürdükdə limit ayda 10 000 dollardır və gündəlik limit yoxdur. Yaxın qohumlar dedikdə ər/arvad, valideynlər, o cümlədən ərin/arvadın valideynləri, baba, nənə, nəvə, uşaq, övladlığa götürülmüş uşaq, qardaş və ya bacı başa düşülür. Yaxın qohumlara pul köçürmək üçün yaxın əlaqəni təsdiq edən sənəd təqdim etmək lazımdır.

Əgər bu məbləğ fiziki şəxs (rezident və ya qeyri-rezident) tərəfindən əvvəllər nağd şəkildə Azərbaycana gətirilibsə və ya bu məbləğ onun bank hesabına köçürülübsə, xarici valyutada vəsaitin xaricə köçürülməsinə məhdudiyyət qoyulmur, habelə fiziki şəxsin adına vəsait hesab açılmadan xaricdən pulköçürmə sistemləri vasitəsilə daxil olduqda. Bu cür köçürmələr üçün yenə də əvvəllər tamamlanmış əməliyyatları təsdiq edən sənədlər tələb olunur.

Pul köçürmə sistemi maliyyə vasitəçisidir, bunun sayəsində bank hesabı açmadan fiziki şəxslərə vəsait köçürmək mümkündür.

Tez-tez istifadə olunan sistemlərdən biri Western Union-dur. Bu sistem müasir dünyanın ən böyük sistemlərindən biridir, fiziki şəxslər arasında pul vəsaitlərinin sürətli köçürülməsi üçün

nəzərdə tutulmuşdur. Bu sistem vasitəsilə dünyanın istənilən yerinə pul köçürmələri etmək mümkündür.

Növbəti tez-tez istifadə olunan sistem "Zolotoy Korona"-dır. "Zolotoy Korona"vasitəsilə 5 dəqiqə ərzində Rusiya, Gürcüstan, Qazaxıstan, Türkiyə və digər ölkələrə dollar, avro və manatla pul əməliyyatları həyata keçirmək mümkündür.

Qeyd etmək istəyirəm ki, Kapital Bank tərəfindən 2007-ci ildə yaradılmış və Azərbaycan, Rusiya, Ukrayna, Gürcüstan və Tacikistan banklarında fəaliyyət göstərən digər beynəlxalq təcili pul köçürmələri sistemi isə "Xəzri" sistemidir. Sistem bankomat vasitəsilə 1000 AZN-ə qədər ölkədaxili pul köçürmələrini qəbul etmək imkanı yaradır.

2013-cü il yanvarın 1-dən qüvvəyə minmiş "Bank hesablarının açılması, banklarda əməliyyatların aparılması və hesabların bağlanması haqqında" qanuna uyğun əməliyyatların aparılması üçün aşağıdakı sənədlər tələb olunur: (Məmmədov Z.F., 2013, s. 130)

1. şəxsiyyət vəsiqəsi (Azərbaycan Respublikasının vətəndaşları üçün);
2. pasport və ya Azərbaycan Respublikasının ərazisində müvəqqəti və ya daimi yaşamaq üçün icazə (əcnəbilər üçün);
3. Azərbaycan Respublikasının ərazisində daimi yaşayan vətəndaşlığı olmayan şəxslərə verilmiş şəxsiyyət vəsiqəsi və ya vətəndaşlığı olmayan şəxslərə Azərbaycan Respublikasının ərazisində müvəqqəti və ya daimi yaşamaq üçün verilmiş icazə;
4. Hərbi bilet (hərbi xidmətdə olanlar üçün);
5. Hərbi qulluqçuların və könüllü olaraq hərbi xidmətə qəbul edilmiş qadınların (hərbi qulluqçular istisna olmaqla) aldıqları müddətli həqiqi hərbi xidmət növündən asılı olaraq şəxsiyyəti təsdiq edən sənədlər formasında verilən sənədlər;
6. Həqiqi hərbi xidmətə daxil olmuş Azərbaycan Respublikası vətəndaşlarına verilən hərbi pasport;
7. Qaçqın şəxsiyyət vəsiqəsi (qaçqın statusu olan şəxslər üçün).

SWIFT ən vacib pul köçürmə sistemlərindən biri hesab edilir. SWIFT hələ 1974-cü ildə fəaliyyətə başlayıb və bu gün 11 000-dən çox maliyyə institutu ondan istifadə edir. Bu sistemin köməyi ilə maliyyə qurumları banklar vasitəsilə vəsait mübadiləsi aparırlar. SWIFT vasitəsilə köçürmələr, demək olar ki, bütün valyutalarda və dünyanın hər yerində mümkündür. Burada bütün məlumatlar təhlükəsiz kanallar vasitəsilə göndərilir, ona görə də təhlükəsizdir. Başqa sözlə, cəmiyyətin əsas vəzifəsi banklar arasında köçürmələr zamanı məlumat mübadiləsidir, burada hər şey şifrələmə sisteminə uyğun baş verir. Bütün əməliyyatlar beynəlxalq səviyyədə həyata keçirilir.

SWIFT kodu kimi bir anlayış mövcuddur. Bu kod SWIFT sisteminə daxil olduqda verilir və unikaldır. Bu sistemə qoşulduqda banklar sənədləri təqdim edir və yalnız bankın sistemə qəbul edilməsinə baxıb qərar verdikdən sonra onlar üçün unikal SWIFT kodu yaradılır. Bu koddan bu sistem vasitəsilə əməliyyatlar aparılarkən istifadə olunur, kodun olması səbəbindən iş prosesi sürətlənir.

Xarici banklarda açılmış hesablara vəsaitlərin köçürülməsi mürəkkəb prosesdir. Bu halda təcili pul köçürmə sistemləri kömək etməyəcək. Bu cür köçürmələr üçün S.W.I.F.T sistemindən istifadə olunur, burada köçürmələr mümkün qədər dəqiq aparılır. Bu sistemin digərlərindən fərqləndirici cəhətlərindən biri də odur ki, köçürmələr həyata keçirərkən pulu alanın məlumatlarını mütləq qeyd etməlisiniz. Son dərəcə diqqətli olmalısınız, çünki məlumatları səhv göstərsəniz, pul vəsaiti alanın hesabına daxil olmaya bilər, bu halda müəyyən müddətdən sonra pul göndərənin hesabına geri qaytarılır.

Bu sistem vasitəsilə köçürmə etmək üçün aşağıdakı məlumatları təqdim etmək lazımdır: (Məmmədov Z.F., 2013, s. 73)

- İlk növbədə əsas məlumatlardan biri benefisiar bankın SWIFT kodu;
- Bankın tam adını;
- benefisiarın hesab nömrəsi, yəni 28 simvoldan ibarət olan IBAN;
- Pulun göndərildiyi bank filialının adı;
- Vasitəçi bankın məlumatları.

SWIFT sisteminin aşağıdakı üstünlükləri mövcuddur:

- Hər hansı problem yarandırqa, gecə-gündüz işləyən Swift dəstək mərkəzi ilə əlaqə saxlamaq mümkündür;
- Əlaqə saxladıqda həm onlayn, həm də telefonla kömək edə bilərlər;
- Başqa bir müsbət cəhət odur ki, dil seçimi şansı mövcuddur (ingilis və rus);
- Bu sistem vasitəsilə pul göndərilərkən köçürmələrin məbləği yalnız ölkədən asılı olaraq məhdudlaşdırılır;
- Həm də bütün valyutalarda köçürmələr mümkündür.

Azərbaycanda Milli Ödəniş Sistemində aparılmış əməliyyatların sayı 2018-2021-ci illər üzrə təhlil edilmişdir və təhlilin nəticələri aşağıdakı kimidir.




**Şəkil 1.** Milli Ödəniş Sistemində aparılmış əməliyyatların sayı 2018-2021-ci illər üzrə (milyon ədədlə)

Bu əməliyyatların məbləğ olaraq həcmi isə aşağıdakı formadadır.




**Şəkil 2.** Milli Ödəniş Sistemində aparılmış əməliyyatların həcmi 2018-2021-ci illər üzrə (milyard manatla)

Nağdsız aparılan ödənişlərin böyük əksəriyyəti ödəniş kartları vasitəsi ilə həyata keçirilir. Ölkədə ödəniş kartlarının sayı isə 2021-ci ildə artım göstərərək 10,4 milyon ədədə çatmışdır ki, bu rəqəm son illərin ən yüksək rəqəmidir.




**Şəkil 3.** Ödəniş kartlarının sayı (milyon ədədlə)

Ödəniş kartları strukturuna görə debet kart və kredit kartı formasında olur. 2021-ci ildə debet kartlarının sayı kredit kartlarının sayından kəskin fərqlənmişdir.




**Şəkil 4.** Ödəniş kartlarının strukturu (2021-ci il)

2021-ci ildə Azərbaycan ödəniş kartları ilə aparılan ölkədaxili nağdsız əməliyyatların sayı və həcmi əvvəlki illərə nisbətən daha yüksək olmuşdur. 2021-ci ildə bu əməliyyatların sayı 88.2 milyon, həcmi isə 4.5 milyard manat olmuşdur.




**Şəkil 5.** Ödəniş kartları ilə aparılan ölkədaxili nağdsız əməliyyatların sayı (milyon ədədlə)

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023




**Şəkil 6. Ödəniş kartları ilə aparılan ölkədaxili nağdsız əməliyyatların həcmi (milyard manatla)**

Aşağıdakı cədvəldə 2021-ci və 2022-ci illər üzrə nağdsız ödənişlərin statistikası təqdim edilmişdir. Cədvəldə hər iki ilin ayları üzrə müxtəlif ödəniş sistemlərində aparılan əməliyyatlar əks olunmuşdur. Cədvəldən göründüyü kimi həm 2021-ci il, həm də 2022-ci il üzrə nağdsız əməliyyatların sayı XÖHKS ödəniş sistemində çox olsa da, əməliyyat həcmi baxımından AZIPS sistemi daha öndədir.
Qeyd etmək istərdim ki cədvəldə qeyd edilən AÖS – ani ödənişlər sistemidir və ölkəmizdə 2020-ci ilin oktyabrın 1-dən istifadəyə verilmişdir.

**Cədvəl 1.** Milli ödəniş sistemləri üzrə əməliyyatlar.

| Tarix | AZIPS | | | XÖHKS | | | AÖS* | | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | Sayı, min ədəd | Məbləği, mln.manat | Bir ödənişin məbləği, min manat | Sayı, min ədəd | Məbləği, mln. manat | Bir ödənişin məbləği, manat | Sayı, min ədəd | Məbləği, mln. manat | Bir ödənişin məbləği, min manat |
| 2021 | 1113.0 | 183756.0 | 165.1 | 69639.0 | 33906.0 | 486.9 | 117.0 | 280.0 | 2.4 |
| 01 | 51.0 | 13785.0 | 270.3 | 5415.0 | 2267.0 | 418.7 | 5.0 | 15.0 | 3.0 |
| 02 | 76.0 | 12400.0 | 163.2 | 5778.0 | 2183.0 | 377.8 | 5.0 | 13.0 | 2.6 |
| 03 | 82.0 | 14508.0 | 176.9 | 6668.0 | 2629.0 | 394.3 | 6.0 | 15.0 | 2.5 |
| 04 | 90.0 | 14052.0 | 156.1 | 6425.0 | 2867.0 | 446.2 | 7.0 | 21.0 | 3.0 |
| 05 | 79.0 | 12880.0 | 163.0 | 5086.0 | 2551.0 | 501.6 | 7.0 | 15.0 | 2.1 |
| 06 | 93.0 | 15547.0 | 167.2 | 5688.0 | 2822.0 | 496.1 | 7.0 | 18.0 | 2.6 |
| 07 | 98.0 | 14643.0 | 149.4 | 4956.0 | 2998.0 | 604.9 | 8.0 | 20.0 | 2.5 |

E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023
ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

| | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|
| 08 | 95.0 | 13210.0 | 139.1 | 5761.0 | 2686.0 | 466.2 | 11.0 | 26.0 | 2.4 |
| 09 | 99.0 | 14417.0 | 145.6 | 5510.0 | 2848.0 | 516.9 | 11.0 | 26.0 | 2.4 |
| 10 | 101.0 | 16235.0 | 160.7 | 5623.0 | 3255.0 | 578.9 | 13.0 | 30.0 | 2.3 |
| 11 | 107.0 | 15818.0 | 147.8 | 6119.0 | 2762.0 | 451.4 | 17.0 | 29.0 | 1.7 |
| 12 | 142.0 | 26261.0 | 184.9 | 6610.0 | 4038.0 | 610.9 | 20.0 | 52.0 | 2.6 |
| 2022 | 1358.6 | 300066.3 | 220.9 | 95896.6 | 41939.1 | 437.3 | 337.3 | 549.6 | 1.6 |
| 01 | 67.0 | 17426.0 | 260.1 | 6018.0 | 2948.0 | 489.9 | 16.0 | 31.0 | 1.9 |
| 02 | 95.0 | 16543.0 | 174.1 | 5920.0 | 2665.0 | 450.2 | 18.0 | 31.0 | 1.7 |
| 03 | 104.0 | 23466.0 | 225.6 | 6286.0 | 3302.0 | 525.3 | 22.0 | 35.0 | 1.6 |
| 04 | 112.1 | 20839.3 | 185.9 | 6480.9 | 3425.6 | 528.6 | 25.2 | 43.0 | 1.7 |
| 05 | 103.6 | 16256.3 | 156.9 | 6720.7 | 3242.4 | 482.5 | 24.1 | 39.1 | 1.6 |
| 06 | 116.8 | 14850.1 | 127.2 | 6751.2 | 3257.9 | 482.6 | 27.4 | 45.6 | 1.7 |
| 07 | 110.0 | 15694.9 | 142.7 | 6965.5 | 3536.9 | 507.8 | 30.6 | 50.4 | 1.6 |
| 08 | 121.2 | 15361.7 | 126.8 | 9746.2 | 3436.9 | 352.6 | 31.2 | 50.2 | 1.6 |
| 09 | 118.9 | 33364.5 | 280.5 | 9486.8 | 3224.0 | 339.8 | 32.1 | 47.6 | 1.5 |
| 10 | 119.5 | 36943.4 | 309.2 | 11063.3 | 3664.3 | 331.2 | 30.8 | 45.2 | 1.5 |
| 11 | 125.4 | 39324.4 | 313.6 | 9989.2 | 3814.9 | 381.9 | 34.1 | 49.8 | 1.5 |
| 12 | 165.1 | 49996.5 | 302.8 | 10468.9 | 5421.1 | 517.8 | 45.7 | 81.8 | 1.8 |

**Mənbə:** https://cbar.az/page-45/payment-system-indicators

2022-ci il üzrə AZİPS və XÖHKS ödəniş sistemlərində aparılan əməliyyatların sayının dinamikası isə növbəti qrafiklərdə təsvir edilmişdir.




**Şəkil 7.** AZİPS ödəniş sistemində aparılan əməliyyatların sayının dinamikası (2022, min ədədlə)




**Şəkil 8.** XÖHKS ödəniş sistemində aparılan əməliyyatların sayının dinamikası (2022, min ədədlə)

**Nəticə**

Nağdsız ödənişlər sisteminin bir çox üstünlükləri mövcuddur. Nağdsız ödənişlər əhaliyə vaxta qənaət, saxta əskinaslarla hesablaşmamaq, nağd pul daşınmasının yaratdığı təhlükədən müdafiə olunmaq, elektron ticarət etmək və ya kommunal ödənişləri ödəmək kimi imkanlar yaradır.

Eyni zamanda, nağdsız ödənişlər ölkə iqtisadiyyatına da təsirsiz ötüşmür. Nağdsız ödənişlər makroiqtisadi idarəetməni asanlaşdırmaqla iqtisadiyyata böyük təsir göstərir. Bu ödəniş üsulundan istifadə etməklə iqtisadiyyatda maliyyə intizamı güclənir, şəffaflıq artır ki, bu da kölgə iqtisadiyyatının səviyyəsinin azalması deməkdir. Ölkəmizdə nağdsız ödənişlərin həcminin 10 faiz artması kölgə iqtisadiyyatının həcminin 5 faizə qədər azalması deməkdir.

## ƏDƏBİYYAT

1. Azerbaycan Respublikası Merkezi Bankının "Debet və kredit kartları vasitesilə aparılan emeliyyatların sayı və hecmi haqqında statistik hesabatı/- Bakı, 31 may 2021.
2. Əziz Xəlilov/ Nagdsız odenishlerin inkishaf yolları, http://vergiler.az/art-view/4906//-2023
3. Azerbaycan Respublikası Merkezi Bankının resmi internet sehifesi, www.cbar.az;
4. Sadıqov E. "Bank əməliyyatları".-Bakı, 2010
5. Azerbaycan Respublikası Merkezi Bankının "Banklarda İnformasiya Texnologiyalarının tətbiqi qaydaları".- Bakı. 10 dekabr 2014.
6. https://faktxeber.ru/News_h466868.html, 2018
7. Memmedov Z.F. Bank fealiyyətinin esasları.-Bakı, 2013
8. https://cbar.az/page-45/payment-system-indicators

E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023
ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

# АНАЛИЗ СИСТЕМЫ БЕЗНАЛИЧНЫХ РАСЧЕТОВ В АЗЕРБАЙДЖАНСКОЙ РЕСПУБЛИКЕ

**Анар Пашаянов[1], Ниджат Гусейнов[2]**
[1,2] Азербайджанский государственный экономический университет,
[1,2] кафедра Экономики и технологических наук.
[1]кандидат экономических наук
[2]магистрант, nicat689@bk.ru

## РЕЗЮМЕ

Рынок платежных инструментов и технологий постоянно развивается. Однако для внедрения новых инструментов необходимо определить их соответствие потребностям пользователей платежных услуг. Под платежным инструментом понимается способ осуществления платежной операции, в том числе формы безналичных расчетов и электронных платежей, то есть, по существу, форма распоряжения или сообщения о переводе денежных средств. По количеству совершаемых операций в структуре платежей наиболее распространенным платежным инструментом являются расчеты с использованием банковских поручений, операции на основании платежных поручений и переводы физических лиц без открытия счета. В связи с развитием современных технологий все более востребованными становятся удаленные формы ведения счетов, поскольку они позволяют значительно ускорить бизнес-процесс и сэкономить средства за счет исключения процедур выдачи бумажных документов. Платежные карты являются одним из наиболее динамично развивающихся сегментов безналичных платежных инструментов. Наблюдается положительная динамика количества выпущенных банковских карт, что свидетельствует о том, что большинство населения отдает предпочтение данному виду банковских продуктов. Значительному увеличению объема безналичных розничных платежей с использованием банковских карт способствовало расширение спектра и инфраструктуры платежных услуг, предоставляемых кредитными организациями клиентам, использующим их. Таким образом, мы можем отметить, что в нашей стране увеличился спрос на платежные инструменты, а также доля безналичных расчетов. Однако, несмотря на рост показателей, характеризующих уровень развития безналичных расчетов, ситуация в Азербайджане все еще далека от уровня развитых стран. В статье рассматривается динамика развития системы безналичных расчетов и анализируется текущая ситуация с безналичными расчетами в платежной системе.

**Ключевые слова**: безналичные расчеты, банковский сектор, процентная ставка, система денежных переводов, банковские карты.

Publication history

Article received: 09.02.2023
Article accepted: 24.02.2023
Article published online: 14.03.2023
DOI suffix: 10.36962/PAHTEI26032023-177

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023
190-202

# IMPACTS OF THE DIGITAL ECONOMY ON THE LABOR MARKET AND EMPLOYMENT

**Rashad Huseynov[1], Novruz Rahimov[2]**
[1,2] Azerbaijan State University of Economics,
[1,2] Department of Economics and Technological Sciences
[1]Candidate of economic sciences,
[2] Master student, Email: novruzrehimov@gmail.com

## ABSTRACT

The digitalization process does not occur simultaneously in different countries of the world, and therefore there is a certain gap in the degree of digitalization of national economies, which leads to a digital divide and, as a result, an increase in the dependence of developing countries on the economy. In the process of digital transformation of the country's economy, politics, legal norms, traditions and culture, the achieved level of economic development, the level of education and its own technological base, as well as many other factors play an important role. In the conditions of the digital economy, one of the main directions of the social and economic policy of the state in the Republic of Azerbaijan is the regulation of the labor market and the provision of full and favorable employment of the country's population.

Currently, the digital economy is a phenomenon that dictates a paradigm for the development of new directions in the economy for all countries. The areas of the economy that are lagging behind in terms of the level of application of information and communication technologies are determined by the state, the need to develop targeted indicators for studying the impact of ongoing digitization, and the need to prepare a plan for the application of new technologies to production is noted and worked on. Examples of industries where digitization will significantly reduce inefficiencies include transportation and logistics, utility infrastructure, healthcare, and education. In general, the state policy in this area is aimed at the growth of the digital economy through the development of the national IT sector.

The programs implemented in the field of employment, measures aimed at the development of the non-oil sector, the directing of large-scale investments to the regions, the creation of new workplaces, enterprises, infrastructure facilities and so on in the regions had a great role in ensuring employment in the country. However, for certain reasons, the demand for jobs in the country remains high. That is, despite the work done, there are still problems in the labor market of Azerbaijan. These problems are mainly due to the lack of self-permanent jobs, the high level of unemployment and migration among young people, the fact that the quality of the labor force does not meet the requirements of the labor market, the level of informal employment is still large, the uneven distribution of labor resources across zones, and the lack of jobs. it is manifested in its seasonal character, low salary level in many specialties. This requires constant improvement of the policy in the direction of ensuring the employment of the population. For this, there is a need to implement systematic measures in a number of directions in the field of employment.

The digitalization process covering the labor market will lead to a shortage of personnel in new professions, revealing the lack of qualifications of employees to work on the implementation of their functions in new conditions. Retraining of professionals will play a major role in future

changes, so it is necessary to pay attention to additional education for the demand in the labor market.
The education system should be modernized and new quality competitive human capital based on the realities of the digital society should be formed. The renewal of production must be carried out in parallel with the retraining of workers at all levels and fields and the preparation of new personnel for the inevitable technological progress. In addition to acquiring deeper knowledge, education is considered as a guarantee of improving the quality of human capital and increasing labor efficiency. In turn, investments in human capital are the main source of its accumulation and reproduction.
The article is devoted to the analysis and assessment of the impact of the digital economy on the labor market. The study focused on the importance of digital transformation in the development of the economy.
**Keywords:** digital economy, labor market, employment, vocational training, human capital

# ƏMƏK BAZARI VƏ MƏŞĞULLUĞA RƏQƏMSAL İQTİSADİYYATIN TƏSİRLƏRİ

**Rəşad Hüseynov[1], Novruz Rəhimov[2]**
[1,2]Azərbaycan Dövlət İqtisad Universiteti, [1,2]"İqtisadiyyat və texnoloji elmlər" kafedrası
[1]iqtisad üzrə fəlsəfə doktoru
[2] magistr tələbəsi, Email: novruzrehimov@gmail.com

## XÜLASƏ

Rəqəmsallaşma prosesi dünyanın müxtəlif ölkələrində eyni vaxtda baş vermir və buna görə də milli iqtisadiyyatların rəqəmsallaşma dərəcəsində müəyyən boşluq var ki, bu da rəqəmsal uçuruma və nəticədə inkişaf etməkdə olan ölkələrin iqtisadiyyatdan asılılığının artmasına səbəb olur. Ölkə iqtisadiyyatının rəqəmsal transformasiyası prosesində siyasət, hüquqi normalar, adət-ənənələr və mədəniyyət, əldə edilmiş iqtisadi inkişaf səviyyəsi, təhsilin səviyyəsi və onun öz texnoloji bazası, eləcə də bir çox digər amillər mühüm rol oynayır. Rəqəmsal iqtisadiyyat şəraitində Azərbaycan Respublikasında da dövlətin sosial-iqtisadi siyasətinin əsas istiqamətlərindən birini də əmək bazarının tənzimlənməsi, ölkə əhalisinin tam və əlverişli məşğulluğunun təmin olunması təşkil edir. Məşğulluq sahəsində həyata keçirilən proqramların, qeyri-neft sektorunun inkişafına yönəldilmiş tədbirlərin, regionallara böyük həcmdə investisiyaların yönəldilməsinin, bölgələrdə yeni iş yerlərinin, müəssisələrin, infrastruktur obyektləri və sairin yaradılmasının ölkədə məşğulluğun təmin olunmasında böyük rolu olmuşdur. Ancaq müəyyən səbəblərdən ölkədə iş yerlərinə olan tələbat hələ də yüksək olaraq qalır. Məqalə əmək bazarında rəqəmsal iqtisadiyyatın təsirinin təhlili və qiymətləndirilməsinə həsr olunmuşdur. Tədqiqatda iqtisadiyyatın inkişafında rəqəmsal transformasıyanın əhəmiyyətinə diqqət yönəldilmişdir.
**Açar sözlər:** rəqəmsal iqtisadiyyat, əmək bazarı, məşğulluq, peşə hazırlığı, insan kapitalı

## Giriş

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023

Son onilliklərdə iqtisadiyyatın və bütövlükdə cəmiyyətin inkişafının əsas tendensiyalarından biri informasiya texnologiyalarının insan həyatının müxtəlif sahələrinə nüfuz etməsidir. İnformasiyalaşdırma əmək məhsuldarlığının artmasında və həyat keyfiyyətinin yaxşılaşdırılmasında elə mühüm amilə çevrilir ki, baş verən dəyişiklikləri tədqiqatçılar iqtisadi inkişafın yeni mərhələsinin başlanğıcı kimi qiymətləndirirlər. Ədəbiyyatda iqtisadi inkişafın bu mərhələsi "informasiya iqtisadiyyatı" termini ilə xarakterizə olunur. Bu gün informasiyalaşdırmanın inkişafı, ilk növbədə, internet və mobil qurğular olan rəqəmsal kommunikasiya texnologiyalarının tətbiqi ilə bağlıdır. Belə texnologiyalara əsaslanan iqtisadiyyat sektoru "rəqəmsal iqtisadiyyat" adlanır (Hüseynova L.N., 2016, s.178).
Azərbaycanda rəqəmsal iqtisadiyyat rəqəmsal məlumatların istehsalda əsas amil olduğu, böyük həcmlərin işlənməsi və təhlilinin nəticələrindən istifadə etdiyi iqtisadi fəaliyyət kimi müəyyən edilir. Bu fəaliyyət ənənəvi idarəetmə formaları ilə müqayisədə müxtəlif istehsal növlərinin, texnologiyalarının, avadanlıqlarının, saxlanmasının, satışının, malların və xidmətlərin çatdırılmasının səmərəliliyini əhəmiyyətli dərəcədə artıra bilər. Hazırda Azərbaycan iqtisadiyyatının rəqəmsallaşmasının əsasını bu proses üçün zəruri olan hüquqi, texniki və iqtisadi infrastrukturun yaradılmasına yönəlmiş dövlət proqramları təşkil edir.

**Məqsəd**

Məqalənin məqsədi rəqəmsal iqtisadiyyatın əmək bazarına təsiri məsələlərinin qiymətləndirilməsidir. Bu məqsədin reallaşması üçün bu əsasda praktiki tövsiyələr hazırlamaq əsas vəzifə seçilmişdir.

**Problemin aktuallığı və əlaqəli tədqiqatlar**

Hazırda rəqəmsal texnologiyalar dünya iqtisadiyyatının artımının və texnoloji inkişafının əsas mühərriklərindən biridir. RT-nin tətbiqi dünya iqtisadiyyatının müxtəlif sektorlarının rəqabət qabiliyyətinin artırılmasına, rəqəmsal qlobal dəyər zəncirlərinə qoşulma baxımından yeni biznes imkanlarının yaradılmasına, yeni bazarların və nişlərin yaranmasına, yeni rəqəmsal malların qlobal miqyasda sürətlə tətbiqinə kömək edir.

**Metodlar**

Metodologiya və tədqiqat metodları xarici və yerli alimlərin dünya iqtisadiyyatının inkişafı problemlərinə, rəqəmsal texnologiyaların əmək bazarında rolu və təsirinə, rəqəmsal iqtisadiyyatın formalaşmasının xüsusiyyətlərinə metodoloji yanaşmalarına əsaslanır. Məqalədə elmi biliklərin, sistemli təhlilin müxtəlif üsullarından istifadə edilmişdir: deduksiya, induksiya, analiz, sintez, müşahidə, müqayisə. Bu metodların istifadəsi bizə daha dərindən tədqiqat apararaq rəqəmsal iqtisadiyyatın əmək bazarı və məşğulluğa təsirini öyrənməyə imkan verir. Analiz və sintez metodları tətbiq edilərək statistik məlumatlar əsasında əmək bazarının göstəriciləri təhlil edilmiş, reqressiya analizi aparılmışdır. Alınmış nəticələr müqayisə metodu ilə təqdim edilmişdir.
Əhalinin məşğulluq baxımından əhali üçün iqtisadiyyatın rəqəmsallaşmasının imkanlarını və təhdidlərini qiymətləndirmək lazımdır. Əmək bazarına və sahibkarlıq sahəsində informasiya və rabitə texnologiyalarının təsirini təhlil etmək, iki əsas nəticə ilə fərqlənə bilər: birincisi, rəqəmsal iqtisadiyyatda işçi ilə işəgötürən arasında qarşılıqlı əlaqənin effektivliyi onların yerləşdiyi yerdən asılı olmağıdır; ikincisi, rəqəmsal iqtisadiyyat sənaye istehsalı formasında qəbul edilmiş sərt gündəlik rejimi dəyişir, işçinin insan kapitalından istifadəni çevik edir (Ernst E., Merola R., Samaan D., 2018, s.217).

E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023
ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

Hazırda rəqəmsal iqtisadiyyat bütün dövlətlərə iqtisadiyyatda yeni istiqamətlərin inkişafı üçün paradiqma diktə edən fenomendir. Dövlət tərəfindən iqtisadiyyatın informasiya-kommunikasiya texnologiyalarının tətbiqi səviyyəsinə görə geridə qalan sahələri müəyyən edilir, davam edən rəqəmsallaşmanın təsirinin öyrənilməsi üçün məqsədli indikatorların işlənib hazırlanması, yeni texnologiyaların istehsalata tətbiqi planının hazırlanması zərurəti qeyd edilərək üzərində işlənilir. Rəqəmsallaşmanın səmərəsizliyi əhəmiyyətli dərəcədə azaldacağı sənayelərə nümunə olaraq nəqliyyat və logistika sənayesi, kommunal infrastruktur, səhiyyə və təhsili göstərmək olar. Ümumilikdə, bu sahədə dövlət siyasəti milli İT sektorunun inkişafı vasitəsilə rəqəmsal iqtisadiyyatın böyüməsinə yönəlmişdir.
Statistik məlumatlara əsasən, ölkəmizdə 2005-2021-ci illər üzrə rəqəmsallaşmada əsas göstəricilərin dinamikası isə aşağıdakı kimidir.

**Cədvəl 1.** Rəqəmsallaşma üzrə əsas göstəricilər

| Göstəricilərin adı | 2005 | 2010 | 2015 | 2016 | 2017 | 2018 | 2019 | 2020 | 2021 |
|---|---|---|---|---|---|---|---|---|---|
| Əhalinin hər 100 nəfərinə düşən internet istifadəçilərinin sayı, nəfər | 8 | 46 | 77 | 78 | 79 | 80 | 81 | 85 | 87 |
| Əhalinin hər 100 nəfərinə düşən genişzolaqlı internet istifadəçilərinin sayı, nəfər | 2 | 15 | 72 | 72 | 73 | 75 | 77 | 83 | 85 |
| Əhalinin hər nəfərinə düşən beynəlxalq internet kanallarının həcmi, kbit/s | 0,04 | 4,6 | 54,0 | 68,0 | 79,6 | 83,5 | 111,1 | 181,5 | 198,6 |
| Mobil rabitə ilə əhatə olunmuş ərazidə yaşayan əhalinin ölkə əhalisinin ümumi sayında xüsusi çəkisi, faizlə | 99,0 | 99,8 | 99,9 | 100,0 | 100,0 | 100,0 | 100,0 | 100,0 | 100,0 |
| Ay ərzində internetdən 20 saatlıq istifadə üçün orta tarif, manat | 5,0 | 1,9 | 1,3 | 1,2 | 1,2 | 1,2 | 0,9 | 0,9 | 0,9 |
| İnternetdən istifadə tarifinin hər nəfərə düşən orta aylıq ümumi milli gəlirə nisbəti, faizlə | 4,5 | 0,6 | 0,3 | 0,3 | 0,2 | 0,2 | 0,1 | 0,1 | 0,1 |
| Ay ərzində 100 dəqiqə mobil rabitə ilə danışıq üçün orta tarif, manat | 18,0 | 7,7 | 6,9 | 6,7 | 6,6 | 6,4 | 6,4 | 6,4 | 6,4 |
| Mobil rabitə danışığı tarifinin hər nəfərə düşən orta aylıq ümumi milli gəlirə nisbəti, faizlə | 16,1 | 2,0 | 1,5 | 1,5 | 1,1 | 1,0 | 1,0 | 1,1 | 0,8 |
| İKT-nin inkişaf indeksi* | 2,58 | 3,78 | 6,23 | 6,25 | 6,20 | 6,33 | 6,49 | 6,64 | 6,67 |

**Mənbə:** Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsinin göstəriciləri. Statistik məcmu. Bakı, 2022.

Cədvəllərə əsasən, 2005-2021-ci illərdə iqtisadiyyat üzrə cəmi məşğulluq göstəricisi ilə əhalinin hər 100 nəfərinə düşən internet istifadəçilərinin sayı arasında müqayisəli analiz aparsaq, müəyyən səviyyədə rəqəmsallaşma ilə əmək bazarı arasında əlaqəni qiymətləndirmiş olarıq.

Göründüyü kimi, 2005-2011-ci illərdə rəqəmsallaşma prosesinin inkişafı daha effektli olmuşdur. Lakin 2011-2021-ci illərdə bu dinamika artım tempi ilə getsə də əvvəlki illərə nisbətən daha yavaş templə irəliləməkdədir. Əhalinin məşğulluq səviyyəsi də bu dinamikaya uyğun olaraq 2005-2020-ci illərdə artım tempi ilə irəliləmişdir. Lakin 2020-ci ildə pandemiya səbəbindən müəyyən geriləmə görülməkdədir.
Rəqəmsallaşmanın da müəyyən təsiri ilə yeni peşələrə tələb yaranmışdır. Bunun nəticəsidir ki, 2020-ci ildə Azərbaycanda ali təhsil müəssisələrində bir sıra yeni ixtisaslar da yaradılmışdır. Bu ixtisaslar qəbul qrupları üzrə aşağıdakı cədvəldə təqdim edilmişdir.

**Cədvəl 2.** 2020-ci ildə ali təhsil müəssisələrində yeni yaradılan ixtisaslar.

| I qrup | II qrup | III qrup | IV qrup | V qrup |
|---|---|---|---|---|
| Aerokosmik mühəndislik | Beynəlxalq ticarət və logistika, | Məktəbəqədər təhsil | Fizioterapiya və tibbi reabilitasiya | Populyar musiqi və caz ifaçılığı (sahələr üzrə) |
| Həyat fəaliyyətinin təhlükəsizliyi mühəndisliyi | Mühasibat | İslamşünaslıq | Tibb bacısı işi | Vokal sənəti (sahələr üzrə) |
| Kommunikasiya sistemləri mühəndisliyi | Turizm bələdçiliyi | İctimai təhlükəsizlik və idarəetmə | İctimai səhiyyə | |
| Mühəndis fizikası, Nəqliyyat mühəndisliyi | Turizm işinin təşkili | | Tibb və Biotexnologiya | |
| Radiotexnika və telekommunikasiya mühəndisliyi | | | | |
| Hərbi rabitə vasitələri mühəndisliyi | | | | |
| Sərhəd təhlükəsizliyi və idarəetmə | | | | |
| Geomatika və geodeziya mühəndisliyi | | | | |
| Aviasiya təhlükəsizliyi mühəndisliyi | | | | |

**Mənbə:** Dövlət İmtahan Mərkəzinin rəsmi saytı, dim.gov.az, 2022.

Yuxarıdakı cədvəldən göründüyü kimi, bu ixtisaslardan aerokosmik mühəndislik, kommunikasiya sistemləri mühəndisliyi, Mühəndis fizikası, Nəqliyyat mühəndisliyi, radiotexnika və telekommunikasiya mühəndisliyi, hərbi rabitə vasitələri mühəndisliyi, sərhəd təhlükəsizliyi və idarəetmə, geomatika və geodeziya mühəndisliyi, aviasiya təhlükəsizliyi mühəndisliyi, beynəlxalq ticarət və logistika, ictimai təhlükəsizlik və idarəetmə, tibb və biotexnologiya kimi ixtisaslar birbaşa rəqəmsallaşma ilə əlaqədardır. Yəni, 2020-ci ildə yaradılmış 22 ixtisasdan 11-nin yaradılma səbəbi sırf rəqəmsallaşmadır.
Rəqəmsal iqtisadi şəraitdə əmək bazarı kadrların peşə hazırlığının da lazımi səviyyədə olmasını tələb edir. Bu səbəbdən kadrlar mütəmadi olaraq peşə hazırlığını inkişaf etdirməli və

ixtisasartırma təlimlərinə cəlb edilməlidir. Azərbaycanda kadrların peşə hazırlığı strukturu aşağıdakı kimidir.

**Şəkil 1.** Peşə hazırlığı keçənlərin strukturu




**Mənbə:** Müəllif tərəfindən hazırlanmışdır.

Ümumiyyətlə, ölkəmizdə 2010-2021-ci illər üzrə peşə hazırlığı keçmiş kadrların dinamikası aşağıdakı qrafikdə təqdim edilmişdir.

**Şəkil 2.** 2010-2021-ci illərdə peşə hazırlığı keçmiş kadrlar.




**Mənbə:** Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsinin göstəriciləri. Statistik məcmu. Bakı, 2022.

2010-2021-ci illərdə ölkəmizdə yenidən hazırlanan və ixtisas artıran kadrlar aşağıdakı qrafikdə müqayisəli şəkildə təqdim edilmişdir. Göründüyü kimi, 2015-ci ildə yenidən hazırlanan kadrlarla ixtisas artıran kadrların sayı bir-birinə çox yaxın olsa da, 2017-ci ildə onların sayında kəskin fərq görünmüşdür. Eyni zamanda, 2017-ci ildə ixtisas artıranların sayı maksimum həddə çatmışdır.

**Şəkil 3.** Yenidən hazırlanan və ixtisas artıran kadrların müqayisəli təhlili




**Mənbə:** Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsinin göstəriciləri. Statistik məcmu. Bakı, 2022.

Növbəti şəkildə peşə hazırlığı keçənlərin və ixtisas artıranların hansı üsullarla peşə hazırlığı keçməsi əks olunmuşdur.

Ölkəmizdə 2021-ci ildə peşə hazırlığı keçənlərin böyük əksəriyyəti bilavasitə müəssisədə peşə hazırlığı keçmişdir. Bu üsulla peşə hazırlığı keçənlər 45% təşkil etmişdir. Ən az istifadə edilən üsul isə xarici ölkədə peşə hazırlığı keçilməsidir ki, 2021-ci ildə cəmi 14 nəfər bu yolla peşə hazırlığını tamamlamışdır.

Milli iqtisadiyyatın rəqabət qabiliyyətini, məhsulların keyfiyyətini və həcmini, ölkənin ümumi ÜDM-ni artırmaq üçün istehsal prosesinə informasiya və rəqəmsal platformaların tətbiqi istər-istəməz sənaye bazarlarının adi modellərində və strateji hədəflərin reallaşdırılmasında əsaslı dəyişikliklərlə bağlıdır.

Davosdakı Dünya İqtisadi Forumunun təsisçisi və prezidenti, alman iqtisadçısı Klaus Şvab kiberfiziki sistemlərin istehsala kütləvi şəkildə tətbiqi ilə xarakterizə olunan dördüncü sənaye inqilabı arasındakı keyfiyyət fərqini müdafiə edir. Bu effekt əsasən insanların rəqəmsal cəmiyyət dövrünə uyğunlaşması probleminin aktuallığını və əhəmiyyətini müəyyən edən sərhədlərin silinməsi prinsipini ehtiva edir. Rəqəmsal iqtisadiyyata sürətlə artan tələbatda sosial-iqtisadi inkişafın əsas hərəkətverici qüvvəsi olan insan kapitalının İKT alətlərinin informasiya kapitalına olan yeri məsələsi kəskin şəkildə gündəmə gətirilir.

**Şəkil 4.** Peşə hazırlığı keçmiş və ixtisaslarını artırmış işçilərdən təhsil alanların strukturu

E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023
ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL




**Mənbə:** Müəllif tərəfindən hazırlanmışdır.

**Şəkil 5.** 2021-ci ildə peşə hazırlığı keçmiş və ixtisaslarını artırmış işçilərdən təhsil alanların faiz nisbəti.




**Mənbə:** Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsinin göstəriciləri. Statistik məcmu. Bakı, 2022.

Qeyd edək ki, iqtisadi aspektdə insan kapitalı, adətən, bilik, bacarıqların məcmusudur. “İnsan kapitalı” - “insan resursları”, “insan potensialı” kimi anlayışlardan bir sıra fərqlərə malikdir ki, bunlardan ən mühümü əmək məhsuldarlığı baxımından iqtisadi qiymətləndirmə və dəyərdir.

Başqa sözlə desək, kapitalın bu forması əmək bazarında satıla bilən, dövlət və sahibkarlıq sərmayəsi, habelə fərdin özünün inkişafı hesabına formalaşan aktiv kimi qəbul edilir. İnsan kapitalı nəzərə alma səviyyəsindən asılı olaraq bir qədər fərqli mənalar alır. Dövlət səviyyəsində bunlar ilk növbədə demoqrafik xüsusiyyətlər, təhsilin, mədəniyyətin və səhiyyənin xüsusiyyətləridir. Müəssisələr üçün insan kapitalı peşəkar xüsusiyyətlər şəklində qiymətlidir. Şəxsin qavrayışında insan kapitalı gəlir əldə etmək üçün səmərəli istifadə olunan yığılmış həyat təcrübəsidir (Hacızalov Y.İ., Kərimova Y.R., Hüseynova L.N., 2015, s.185).
Təhlilin istənilən variantında insan kapitalı birbaşa təhsil sisteminin keyfiyyəti ilə bağlıdır. Beləliklə, hazırda cəmiyyətin inkişafının strateji prioriteti - İKT-dən istifadə üzrə biliklərin təkmilləşdirilməsini, müasir texnoloji inqilaba uyğun olaraq təhsilin təkmilləşdirilməsini və kadrların formalaşması üçün ixtisas tələblərinin artırılmasını əhatə edən zəruri rəqəmsal təhsil məsələsi qaldırılmaqdadır.
Bununla belə, rəqəmsal iqtisadiyyatın müasir şəraitində potensial işçinin işəgötürənin tələblərini ödəməsi ildən-ilə çətinləşir. Bu, sənaye inqilabının prinsiplərindən biri olan robotlaşdırma prosesi ilə bağlıdır. Belə ki, 2016-cı ildə Çində hər 10 min işçiyə 36 sənaye robotu düşür. Almaniyada bu göstərici 8 dəfə, Yaponiyada 9 dəfə, Cənubi Koreyada isə 13 dəfə çox olub. Müqayisə üçün qeyd edək ki, Rusiyada hər 10 min nəfərə düşən robotların sayı Çinlə müqayisədə 20 dəfə azdır ki, bu da Tayland, Meksika, İndoneziya və bir çox başqa ölkələrdən geri qalır. Avtomatlaşdırmanın başqa bir nümunəsi, Çinin “Changying Precision Technology” şirkətinin mobil telefon hissələrinin istehsalı üçün zavodunda insanların robotlarla geniş miqyasda dəyişdirilməsidir, bunun sayəsində məhsuldarlıq təxminən üç dəfə artmışdır (ayda 8000-dən 21 min ədədə qədər). Belə ki, bu dəyişikliklə məhsullarda qüsurlu məhsulların miqdarı 25%-dən 5%-dən aşağı düşmüşdür. Bu fəaliyyətlər ÇXR-in tam texnoloji müstəqilliyinə nail olmaq planının bir hissəsi kimi həyata keçirilir - "Made in China 2025", burada sənaye robotlaşdırılması Çin istehsalının modernləşdirilməsində əsas element kimi qəbul edilir.
Bu məlumatlar süni intellektin üstünlüklərini göstərir ki, bu da bir insanla müqayisədə daha az xərc, səhvlərin sayını minimuma endirmək, daha yüksək məhsuldarlıq və əməliyyatların sürətidir. Bundan əlavə, bu gün ağır monoton fiziki əməyi yerinə yetirən maşındır və insan fiziki imkanlarına görə sadəcə olaraq bir çox robotlarla rəqabət apara bilmir. Hələ 1931-ci ildə iqtisadçı Con Meynard Keyns əmək bazarına texnoloji mənfi təsirin olacağını proqnozlaşdırmışdı.
İqtisadiyyat nəzəriyyəsində Keyns istiqamətinin banisi xəbərdarlıq edirdi ki, əməyin iqtisadi cəhətdən istifadə yollarının kəşfi əməyin yeni istifadə üsullarının kəşfi tempini qabaqlayır. İş yerlərinin hər gün artan avtomatlaşdırılması insan kapitalının dünya iqtisadiyyatının strukturundan sıxışdırılmasına səbəb ola bilər ki, bu da müvafiq olaraq qlobal miqyasda işsizliyin yüksək səviyyəsinə səbəb olacaqdır (Şirinkina E.V., 2019, s. 74).
İlk növbədə dördüncü sənaye inqilabı mühasiblər, müəllimlər, dövlət və bələdiyyə işçiləri, maliyyə analitikləri kimi peşələri təhdid edir. Əgər bu kritik vəziyyəti qlobal miqyasda nəzərə alsaq, onda 2040-2045-ci illərdə iş yerlərinin təxminən 47%-i yox olacaq. İstehsalın avtomatlaşdırmaya geniş şəkildə keçidi ilə əlaqədar “texnoloji işsizlik”-in təsiri iqtisadi məqsədəuyğunluq səbəbindən orta ixtisaslı işçilərə təsir edəcək, çünki bu səviyyədə təhsilə malik mütəxəssislər olduqca yüksək ödənişlidir (Ernst E., Merola R., Samaan D, 2018, s. 25).
Bundan əlavə, britaniyalı ekspertlər əmindirlər ki, 2050-ci ilə qədər iş yerlərinin təxminən 47%-i avtomatlaşdırılacaq və milyonlarla insan işsizlər siyahısına salınacaq. Ən çox tələb olunan ixtisaslar ən son texnologiyaların inkişafı, yaradılması, tətbiqi və istifadəsi ilə bağlı olacaq.

“Boston Global Group” beynəlxalq idarəetmə konsaltinq şirkətinin analitikləri də eyni nəticəyə gəliblər. Beləliklə, sənaye səriştələrinin və peşələrinin strukturunda dəyişiklik proqram təminatı və informasiya texnologiyaları sahəsində bacarıqlara malik işçilərə tələbatın artması ilə xarakterizə olunacaq.

“The Future of Jobs”-un məlumatına görə, 2020-ci ilə qədər qlobal əmək bazarına 2 milyon iş yeri əlavə edilmiş, 7,1 milyon iş yeri isə çıxarılmışdır.

Həmçinin, alimlər kompüter ixtisasları üzrə məşğulluğun ildə 4,54%, dizayn və mühəndislik inkişafı üzrə mütəxəssislərin isə 3,54% artacağını qeyd edirlər. Bununla yanaşı, avadanlıqların texniki xidməti, təmiri və quraşdırılması üzrə mütəxəssislərin məşğulluğu ildə 8%, ofis işçilərinin isə 6,2% azalacaq. McKinsey-in fikrincə, 2030-cu ilə qədər dünyada iş əməliyyatlarının 50%-ə qədəri avtomatlaşdırıla bilər və bu proses miqyasına görə 18-19-cu əsrlərdəki sənaye inqilabı ilə müqayisə oluna bilər (Dasgupta S., Singh A., 2020, s.162).

Bununla belə, bu beynəlxalq konsaltinq şirkətinin mütəxəssisləri hesab edirlər ki, müasir istehsal robot mexanizminin baha olması səbəbindən yaxın illərdə mövcud peşələrin yalnız 5%-ni avtomatlaşdırmaq tam mümkündür. Qalan 95% ixtisaslar texnoloji yeniliklərin yalnız qismən tətbiqinə məruz qalır. Məsələn, McKinsey-ə görə, mehmanxana və restoran biznesi ilə bağlı peşələr 75%, dövlət qulluğu isə 31% avtomatlaşdırıla bilər.

Eyni zamanda, Beynəlxalq Robototexnika Federasiyasının (IFR) baş katibinin fikrincə, avtomatlaşdırmaya mənfi tərəfdən baxmaq olmaz, çünki robotlar sağlamlıq risklərinin artması ilə əlaqəli təhlükəli istehsal əməliyyatlarında insanları əvəz edə bilər. Həmçinin, ən son maşın cihazlarının tətbiqi ilə yeni peşələr hesabına kompensasiya baş verir.

Beləliklə, təkcə iqtisadçılar deyil, ümumilikdə işçilər və işəgötürənlər də rəqəmsal səriştələrə ehtiyac olduğunu qəbul edirlər.

Əmək bazarını əhatə edən rəqəmsallaşma prosesi yeni peşələr üzrə kadr çatışmazlığına səbəb olacaq, işçilərin yeni şəraitdə öz funksiyalarının həyata keçirilməsi üzərində işləmək üçün ixtisaslarının çatışmazlığını üzə çıxaracaq. Gələcək dəyişikliklərdə peşəkarların yenidən hazırlığı böyük rol oynayacaq, ona görə də əmək bazarında tələbat üçün əlavə təhsilə diqqət yetirmək lazımdır.

Təhsil sistemi modernləşdirilməli və rəqəmsal cəmiyyətin reallıqlarına əsaslanan yeni keyfiyyətli rəqabətqabiliyyətli insan kapitalı formalaşdırılmalıdır. İstehsalın yenilənməsi bütün səviyyələrdə, sahələrdə işçilərin yenidən hazırlanması və qaçılmaz texnoloji tərəqqi üçün yeni kadrların hazırlanması ilə paralel aparılmalıdır. Təhsil daha dərin biliklər əldə etməklə yanaşı, insan kapitalının keyfiyyətinin yüksəldilməsinin, əməyin səmərəliliyinin artırılmasının təminatı kimi qəbul edilir. Öz növbəsində insan kapitalına qoyulan investisiyalar onun toplanması və təkrar istehsalının əsas mənbəyidir.

Belə ki, Pensilvaniya Universitetində üç mindən çox iş yeri təhlil edilərkən təhsil səviyyəsinin yüksəlməsindən və ya əsas istehsal fondlarının aktiv hissəsinin dəyərinin 10% artmasından asılı olaraq əmək məhsuldarlığının nəticələri əldə edilmişdir. Birinci halda ümumi məhsuldarlığın 8,6 faiz artması, ikinci halda isə vəsaitlərin dəyərinə təsir göstərərək bu göstərici cəmi 3,4 faiz artıb. Bu onu göstərir ki, insan kapitalına qoyulan sərmayənin marjinal gəliri innovativ texnologiyaya qoyulan sərmayənin marjinal gəlirindən 2,5 dəfə çoxdur.

Amerikalı alim Martin Ford hesab edir ki, insan və robot arasında məcburi rəqabət şəraitində ləyaqətlə mövcud olmaq imkanını təmin etmək və eyni zamanda təhsili işlə birləşdirmək üçün zəmanətli gəlir səviyyəsini artırmaq lazımdır. Eyni fikri ən böyük startap inkubatorunun rəhbəri Sem Altman, həmçinin vençur sahibkarı Elon Mask da bölüşür.

İnsan kapitalının formalaşdırılması və istifadəsi sisteminin təkmilləşdirilməsi istiqamətlərindən biri kimi təhsil sektorunu və yüksək ixtisaslı əmək bazarını tənzimləyən formal və qeyri-formal institutların fəaliyyətinin səmərəliliyinin və əlaqələndirilməsinin artırılmasını nəzərdən keçirmək olar. Bu tədbiri həyata keçirmək üçün inzibati maneələri azaltmağa, nəzarət və nəzarət mexanizmlərinə dəyişikliklər etməyə, şəbəkə qarşılıqlı əlaqəsini daha çevik və sərbəst etməyə dəyər ki, bu da gələcəkdə tranzaksiya xərclərinin azalmasına təsir göstərəcək və dövlət, özəl və ictimai balansa töhfə verəcəkdir.
Rəqəmsal texnologiyaların inkişafı bazar şəraitini, iqtisadiyyatda məşğulluq formalarını dəyişir. Bu gün əmək bazarında uzaqdan interaktiv qarşılıqlı əlaqə texnologiyaları getdikcə daha çox populyarlıq qazanır ki, bu da iş qrafikini pozmadan insanların davamlı öyrənməsi üçün şərait yaratmaq üçün dünya təhsilini transformasiya etməyi zəruri edir. Elmi-texniki tərəqqinin reallıqları insanın peşə biliyinə, ixtisasına, bacarıqlarına, intellektual səviyyəsinə getdikcə artan tələblər qoyur. Bu şəraitdə investisiya, rəqabət və innovasiya insan kapitalının inkişafı üçün əsas stimullara çevrilir ki, bu da bir tərəfdən innovasiya sisteminin yaradılmasının, yeni inkişafların əsasını təşkil edir (Şirinkina E.V., 2019, s. 85).
Rəqəmsal texnologiyalar həyatın bütün sahələrində cəmiyyətin geniş miqyaslı təkmilləşdirilməsi vasitəsinə çevrilməlidir (Odeqov Yu.Q., Pavlova V.V., 2018, s. 66).

- sosial problemlərin həlli,
- dövlət, biznes və əhali arasında ünsiyyətin sadələşdirilməsi,
- əmək fəaliyyətinin səviyyəsinin artırılması,
- peşəkar bacarıqların genişləndirilməsi,
- yeni istehlak məhsullarının yaradılması və s.

**Nəticə**

Rəqəmsal iqtisadiyyatın geniş şəkildə formalaşması zamanı insan kapitalı, onun xassələri, funksiyaları, səriştələri informasiya məzmunu baxımından nəzərdən keçirilir. Rəqəmsal bilik və bacarıqlara malik yüksək ixtisaslı, səriştəli mütəxəssislərin hazırlanmasında, uyğunlaşma sürətinin, işçilərin yeni şəraitə rəqabət qabiliyyətinin artırılmasında dövlət və kommersiya qurumlarının rolu artır. İnnovativ iqtisadiyyata keçid, dövlətin strateji vəzifələri kompleksində məhz dövlətin bilik iqtisadiyyatının əsası hesab edilən güclü insan kapitalı bazasının toplanması üçün effektiv təhsil sistemi olmadan mümkün olmayacaq.
Nəticə etibarı ilə, təhsilə vəsaitin ayrılması kifayət qədər məqsədəuyğundur və təkcə ixtisasların alınması və ya təkmilləşdirilməsi üçün deyil, həm də kadrların bilavasitə iş yerində hazırlanması üçün nəzərdə tutulub. Bununla əlaqədar olaraq, təhsilə ayrılan vəsaitlərin artırılmasına, mövcud bazara uyğun olaraq sənaye perspektivlərindən mütəxəssislərin hazırlanmasını təmin etmək üçün universitetlərlə kommersiya təşkilatları arasında əməkdaşlığın formalaşdırılmasına və dəstəklənməsinə yönəlmiş dövlətin uzunmüddətli strateji investisiya siyasəti hazırlana bilər.
Yeni peşəkar bacarıqların inkişaf vektorunu müəyyən etmək və işçinin bütün iş dövrü ərzində rəqabət qabiliyyətli və biliklərini qorumaq üçün şərait yaratmaq lazımdır.
Rəqəmsal iqtisadiyyatın inkişafının əsas hərəkətverici qüvvəsi, əlbəttə ki, yığılmış insan kapitalının daşıyıcısı olan, gələcək inkişafa və təkmilləşməyə hazır olan yüksək təhsilli insanlar olaraq qalır.

**ƏDƏBİYYAT**

1. Huseynova L.N. Emek bazarının optimal davranıshı və inkishafı strategiyalarının qurulması meselesinin qoyulushu. //AMEA İqtisadiyyat İnstitutu "Elmi əsərlər" toplusu elmi-praktiki jurnal..- Bakı, 2016, № 1, s. 139-144
2. Ernst E., Merola R., Samaan D. "The economics of artificial intelligence: Implications for the future of work". ILO Future of Work Research Paper Series. 2018, No. 5. https://www.ilo.org/wcmsp5/groups/public/---dgreports/---cabinet/documents/publication/wcms_647306.pdf
3. Azerbaycan Respublikasının Dovlet Statistika Komitesinin gostericileri. Statistik məcmu. -Bakı, 2022.
4. Dovlet İmtahan Merkezinin rəsmi saytı, dim.gov.az, 2022.
5. Hacızalov Y.İ., Sadıqov Sh. M. İqtisadi sistemlerin riyazi modelleshdirilməshi. –Bakı, 2015
6. Şirinkina E.V. Chelovecheskiy kapital i rınok truda v çifrovom razvitii rossiyskoy ekonomiki // Ekonomika truda.- 2019, № 1, S. 103-112.
7. Cornell University, INSEAD, and WIPO, The Global Innovation Index .-2022.
8. Dasgupta S., Singh A. "Manufacturing, Services and Premature Deindustrialization in Developing Countries: A Kaldorian Analysis." Working Paper. WIDER Research Paper.-2020
9. Odeqov Yu.Q., Pavlova V.V. Noviye texnoloqii i ix vliyaniye na rınok truda // Uroven jizni naseleniya reqionov Rossii.- 2018, №2(208), s. 66.

## ВЛИЯНИЕ ЦИФРОВОЙ ЭКОНОМИКИ НА РЫНОК ТРУДА И ЗАНЯТОСТЬ

**Рашад Гусейнов[1], Новруз Рагимов[2]**
[1,2] Азербайджанский государственный экономический университет
[1,2] кафедра Экономики и технологических наук
[11]кандидат экономических наук
[2]магистрант, Email: novruzrehimov@gmail.com

### РЕЗЮМЕ

Процесс оцифровки не происходит одновременно в разных странах мира, и поэтому существует определенный разрыв в степени оцифровки национальных экономик, что приводит к цифровому разрыву и, как следствие, к росту зависимости развивающихся стран от экономики. В процессе цифровой трансформации экономики страны важную роль играют политика, правовые нормы, традиции и культура, достигнутый уровень экономического развития, уровень образования и его собственная технологическая база, а также многие другие факторы. В Азербайджанской Республике в условиях цифровой экономики одним из основных направлений социально-экономической политики государства является регулирование рынка труда, обеспечение полной и доступной занятости населения страны. Большую роль в обеспечении занятости в стране сыграли программы, реализуемые в сфере занятости, мероприятия, направленные на развитие

ненефтяного сектора, направленные на крупные инвестиции в регионы, создание в регионах новых рабочих мест, предприятий, объектов инфраструктуры и др. Статья посвящена анализу и оценке влияния цифровой экономики на рынок труда. В исследовании основное внимание уделяется важности цифровой трансформации в развитии экономики.
**Ключевые слова:** Цифровая экономика, рынок труда, занятость, профессиональная подготовка, человеческий капитал.

Publication history

Article received: 09.02.2023
Article accepted: 24.02.2023
Article published online: 14.03.2023
DOI suffix: 10.36962/PAHTEI26032023-190

E-ISSN: 2674-5224
203-210 VOLUME 26 ISSUE 03 2023
ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL

# DIGITALIZATION OF PERSONNEL RECORDS IN A HIGHER EDUCATIONAL INSTITUTION

**Orkhan Huseynov**
Azerbaijan Technical University, ICT Department "Programming group", Group leader,
Email: orxan.huseynov@aztu.edu.az

## ABSTRACT

In order to increase the quality of work with personnel in a higher educational institution, to reduce labor and increase efficient work, the creation of a personnel accounting portal and the digitization of labor processes according to the labor code of personnel on the portal are explained.

In the presented article, the working stages of the system are divided into 3 stages. Those stages cover the general working principle of the system. These stages are "Administrative panel", "Personnel registration" and "Personnel operations" stages.

The first stage is the system adjustment stage. So, this panel includes people with administrative powers. There are many menus available in the panel. Through these menus, the admin can enter certain configuration data into the system, for example, the departmental structure of the enterprise, a number of questionnaire data to be used in the system, as well as employee cv data.

In addition, the portal deals with the issues of automating the registration of administrative, professor-teacher, assistant staff and personnel information search. Personnel registration is included in the second stage as described above. Through this stage, a new employee can be added to the system, the data of an existing selected employee can be changed and deleted. The information on the Enter and Change Employee Information page is divided into tabs. Data includes personal data, family composition data, contact data, educational data, identification and job data.

The last stage includes the performance of certain functional works on personnel by the responsible employee of the "Human resources" structure of the enterprise. Leave types are set for employees and vacation days are calculated and entered into the system based on the employee's request. All this is done in accordance with the labor code. In addition, the system takes into account the approval or cancellation of profile pictures of employees. Thus, the photo requested by the user employee is evaluated by the responsible employee of the "Human resources" structure. If it matches, it approves the application, otherwise it cancels it.

One of the issues presented in the article is the provision of system information security and data storage. A study was conducted and a solution was presented to prevent data loss in the event of a power outage, internet connection, or browser session timeout that may occur while entering data in the system. Thus, the temporary storage of data in the browser's cookies or in the database has been investigated. As a result, since smaller-scale data can be stored in cookies and in terms of increasing security, it was decided and organized to store the above-mentioned information in the database.

The system presented in the presented article follows the principles of UI/UX design. UI/UX standards are design guidelines that help create a consistent and intuitive user interface across different devices, platforms, and contexts. These guidelines help create a unified and easily navigable view for users.

The structure of the database in the portal is built dynamically. PostgreSQL was used for the database and CodeIgniter framework, which helps to create dynamic applications through the PHP web programming language, was used to build the user interface.
**Keywords:** personnel accounting portal, database, employee information search, labor leave, user interface.

# ALİ TƏHSİL MÜƏSSİSƏSİNDƏ KADRLARIN UÇOTUNUN RƏQƏMSALLAŞDIRILMASI

**Orxan Hüseynov**
Azərbaycan Texniki Universiteti, İKT şöbəsi "Proqramlaşdırma qrupu", Qrup rəhbəri,
Email: orxan.huseynov@aztu.edu.az

## XÜLASƏ

Ali təhsil müəssisəsində kadrlarla iş keyfiyyətinin artırılması, əməyin azaldılması və səmərəli işin artırılması məqsədilə kadrların uçotu portalının yaradılması və portal üzrə kadrların əmək məcəlləsinə uyğun əmək proseslərinin rəqəmsallaşdırılması şərh edilir. Portalda inzibati, professor-müəllim, köməkçi heyətin qeydiyyatının və kadrların məlumat axtarışının avtomatlaşdırılması məsələlərinə baxılır. Portalda verilənlər bazasının strukturu dinamik olaraq qurulmuşdur. Verilənlər bazası üçün PostgreSQL və istifadəçi interfeysinin qurulması üçün isə PHP veb-proqramlaşdırma dili vasitəsilə dinamik tətbiqlər yaratmağa kömək edən CodeIgniter framework istifadə edilmişdir.
**Açar sözlər:** kadrların uçotu portalı, verilənlər bazası, işçi məlumat axtarışı, əmək məzuniyyəti, istifadəçi interfeysi.

## Giriş

Müasir rəqəmsallaşan dövrdə ali təhsil müəssisələrinin (ATM) rəqəmsallaşdırılmasında müxtəlif formalarda informasiya-kommunikasiya texnologiyalarının (İKT) tətbiqindən bu və ya digər məqsədlə geniş istifadə olunur. Bu vasitələrin ATM-də tətbiqi digər məsələlərdə olduğu kimi kadrların uçotunun səmərəliliyinə də müsbət təsir edir. ATM-də ümumi kompleks idarəetmənin təşkili bir sıra müxtəlif sistemlərin köməyilə həyata keçirilir. Bunlar, "Tələbə qeydiyyatı", "Kargüzarlıq", "Kadrların uçotu", "Tədrisin təşkili", "Tələbə məlumat sistemi", "Personal məlumat sistemi", "Akademik məlumat axtarış və diferensial əmək haqqı", "Kitabxana", "Yataqxana", "Mühasibatlıq" kimi alt sistemlərdən ibarətdir. Təqdim edilən məqalədə universitet idarəetmə sistemində xüsusi yer tutan alt sistemlərdən biri olan "Kadrların uçotu" sisteminin xüsusiyyətləri araşdırılır. Baxılan sistemdə işçi heyətin qeydiyyatı, məlumatların daxil edilməsi, axtarışı və əmək məcəlləsinə uyğun qaydada bır sıra işlərin rəqəmsallaşdırılması istiqamətində yanaşmalar şərh edilir [6].

## Məqsəd

## Problemin aktuallığı və əlaqəli tədqiqatlar

Məqalənin təhlilində əsas məqsəd universitet idarəetməsində müxtəlif yanaşmalar işləməklə müəssisənin kadrlarla iş qabiliyyətinin, əmək səmərəliyinin artırılmasına yönəlmişdir [6]. Əlavə olaraq məqsəd universitetin vahid kadrların uçotu sistemini yaratmaqdır. Təhlil edilən sistemdə mərhələlər şəkil 1-də göstərilən sxemlə tənzimlənir.




**Şəkil 1.** "Kadrların uçotunun rəqəmsallaşdırılması" sisteminin iş sxemi

**Metodlar**

**İnformasiyanın qorunması və saxlanması prinsiplərinin tətbiqi**

Müasir dövrümüzdə telekommunikasiya sahələrində ən əsas tələblərdən biri informasiyanın qorunması və saxlanılmasının təşkilidir. Məqalədə haqqında bəhs edilən sistemdə kadrların şəxsi məlumatları və s. digər məlumatları saxlanılır. Bu məlumatların qorunması və saxlanması zərurəti yaranır. Bunun üçün də məlumatların saxlanılması və qorunması üçün bir sıra tədqiqatlar aparılmış və sistemdə məlumatların tam daxil olunmadan öncə müvəqqəti bufer yaddaş rolunu oynayan mühitdə saxlanması tətbiq edilmişdir.

**İdarəetmə paneli.** Bu alətlər paneli məqalədə haqqında bəhs edilən sistemin tənzimləmə imkanlarını özündə saxlayır. Bu panelə yalnız sistemdə inzibatçı səlahiyyətinə malik olan istifadəçilər daxil ola bilir. İnzibatçı panel vasitəsilə sistemdə bir sıra soraqçaları daxil edə bilər. Alətlər paneli Şəkil 2-də "Konfiqurasiyalar" menyusu vasitəsilə qeyd edilmişdir. Menyu isə özlüyündə 6 alt menyuya bölünmüşdür. Bunlar "Regional", "Məzuniyyət", "Təhsil", "Əlaqə", "Fərdi" və "İnzibati" bölmələridir. Bu bölmələr də özlüyündə digər alt bölmələrə ayrılmışdır. "Regional" adlı bölmədə sistemə ölkə, inzibati rayon və şəhər məlumatları, "Məzuniyyət" bölməsində əmək məcəlləsinə uyğun qaydada məzuniyyət tipləri, əlavə məzuniyyət günləri, "Təhsil" bölməsində kadrların qeydiyyatını apararkən təhsil müəssisəsi məlumatları, CV məlumatları daxil etmək üçün isə imtahan və sertifikat məlumatları, "Əlaqə" bölməsində ünvan tipləri, əlaqə vasitələri, "Fərdi" bölməsində ailə vəziyyəti, qohumluq növləri, əlillik tipləri, hobbilər və nəhayət "İnzibati" bölməsində isə iş müsəssisələri, vəzifə tipləri, şöbə-struktur tipləri, ştat vahidləri və müqavilə müddətləri məlumatları daxil edilir. Şəkil 2-də sistemin idarəetmə paneli təsvir edilmişdir.

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 26 ISSUE 03 2023




**Şəkil 2.** “Kadrların uçotunun rəqəmsallaşdırılması” sisteminin idarəetmə paneli

**Kadrların qeydiyyatı.** Bu bölmə vasitəsilə müəssisəsinin “İnsan resursları” strukturunun məsul işçisi sistemə yeni kadr qeydiyyatını həyata keçirə bilir. Bölmə şəkil 3-də sol menyuda “İşçilər” adlı modulla qeyd edilmişdir.




**Şəkil 3.** “Kadrların uçotunun rəqəmsallaşdırılması” sisteminin “İşçilər” bölməsi

Burdan sistemə yeni işçi əlavə edilə, mövcud seçilmiş işçinin məlumatları dəyişdirilə və həm də silinə bilər. Yeni işçi məlumatları 7 mərhələ ilə şəkil 4-də təsvir edilmişdir. Bu mərhələlər aşağıdakılardır:

- Şəxsi məlumatlar;
- Ailə tərkibi;
- Əlaqə;
- Təhsil məlumatları:
- İdentifikasiya;
- Vəzifə/Müqavilə

ISSN: 1609-1620; E-ISSN: 2674-5224
PAHTEI
REFERRED & REVIEWED JOURNAL




**Şəkil 4.** "Kadrların uçotunun rəqəmsallaşdırılması" sistemində işçinin məlumatlarının daxil edilməsi

Şəkil 5-də nümunə olaraq "Əlaqə" məlumatları mərhələsi təsvir edilmişdir.




**Şəkil 5.** "Kadrların uçotunun rəqəmsallaşdırılması" sistemində "Yeni işçi" səhifəsinin "Əlaqə" məlumatları mərhələsi

Sonuncu mərhələdə isə işçinin işlədiyi struktur məlumatı, strukturda vəzifəsi, ştat növü məlumatı daxil edilir və işçiyə müqavilə hazırlanır.

**Kadrlar üzrə əməliyyatlar.** Sistemdə "İnsan resursları" strukturunun məsul işçisi tərəfindən kadrlar üzrə müəyyən funksional işlər aparılır. İşçilər üçün məzuniyyət tipləri təyin edilir və işçinin müraciətinə əsasən ona məzuniyyət günləri hesablanaraq sistemə daxilir. Bütün bunlar

